"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ

H.Əliyev "Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"






"Bizim bugünkü gəncliyimiz sağlam düşüncəli gənclikdir, vətənpərvər gənclikdir, xalqını, millətini sevən gənclikdir..."

Heydər Əliyev
Ümummilli Lider



"Mənim gənclərə xüsusi münasibətim var, mənim ürəyim sizinlədir. Siz bütün işlərdə mənə arxalana bilərsiniz. Mən də sizə arxalanıram".

İlham Əliyev
Azərbaycan Respublikasının Prezidenti





## "TƏLƏBƏ" XÜSUSİ BURAXILIŞI











*1921-ci ildən təhsilimizin keşiyində...*

Qazet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Mart-Aprel, 2022 / № 10 (1113)

# TƏLƏBƏ TRİBUNASI

**Əziz oxucular! Qəzetimizin budəfəki xüsusi buraxılışında universitetin, filiallarımızın və Pedaqoji Kollecin təhsil və ictimai həyatda fərqlənən uğurlu tələbə-gənclərimizlə tanış olacaqsınız. Beləliklə, "Gənc Müəllim"in tribunasında gələcəyin müəllimləridir.**



**Nəsirov İsmayıl**

2000-ci ildə Quba rayonunda anadan olub. 2007-2018-ci illərdə Amsar kənd tam orta məktəbində təhsil alıb. 2018-ci ildə 518 balla ADPU-nun Tarix və coğrafiya fakültəsinin tarix müəllimliyi ixtisasına qəbul olunub.

Universitetə daxil olduğu zamandan bəri Tələbə Gənclər Təşkilatının (TGT) fəal üzvü olmuş, müxtəlif vəzifələrdə çalışdıqdan sonra 2019-cu ilin dekabrında təşkilatın sədri vəzifəsinə seçilib və hal-hazırda da həmin vəzifəni icra edir. Həmçinin 2020-ci ilin dekabrından bəri ATGTİ-nin sədr müavini vəzifəsini icra edir.

İsmayıl intellektual oyunlara xüsusi maraq göstərir və bu sahədə də bir sıra nailiyyətləri var. "Heydər Əliyev və Azərbaycan tarixi" VI və VII ümumrespublika bilik yarışmalarının, Gənclər Təşkilatlarının Beynəlxalq İnteqrasiya və Təmsilçilik imkanları 3.0, Gələcəyin qurucuları 2, Yay Fest 2021 və s. bir çox layihələrin iştirakçısı, ADPU-nun 100 illiyinə həsr olunmuş təntənəli yubiley mərasimində qrup rəhbəri olmuş, eyni zamanda rəsmi çıxışçılar siyahısında yer alıb.

"ADPU-da təhsil aldığım illər ərzində istər öz ixtisasımla, istərsə də şəxsi inkişafımla bağlı kifayət qədər irəliləməyi bacarmış, aktiv ictimai fəaliyyətim səbəbilə çox geniş bir gənclər çevrəsinə daxil olmuşam.

Abituriyentlərə və tələbələrə də tövsiyəm ondan ibarətdir ki, tələbəlik dönəmi ərzində sağlam təhsil almaqla bərabər özlərini ictimai sferada da sınamağa çalışsınlar. Bu onların həmin müddət ərzində, eyni zamanda gələcək karyeraları boyunca böyük təcrübə əldə etmələrinə şərait yaradacaqdır."




**Ağayev Tərlan**

2000-ci ildə Cəlilabad rayonunda anadan olmuşdur. 2018-ci ildə Buravar kənd tam orta məktəbini fərqlənmə ilə bitirərək ADPU-nun tarix və coğrafiya müəllimliyi ixtisasına qəbul olunmuşdur.

Universitetdə təhsil aldığı müddətdə elmi və ictimai fəaliyyəti ilə seçilmişdir. "Heydər Əliyev və Azərbaycan tarixi" Ümumrespublika bilik yarışında 2 dəfə ADPU-nu təmsil etmişdir. Müxtəlif mövzularda 6 məqalənin müəllifidir. YAP Yay liderlik məktəbinin (2020) məzunudur. 2020-2021-ci illərdə ADPU Yeni Azərbaycan Partiyası Gənclər Birliyinin sədri olmuşdur. Sədrliyi dövründə 400-dən çox layihə həyata keçirilmişdir. Respublika əhəmiyyətli bir neçə elmi konfransın iştirakçısı olmuş,eyni zamanda ADPU-nun 100 illiyinə həsr olunmuş yubiley tədbirində team leader (qrup rəhbəri) olaraq fəaliyyət göstərmişdir. Hazırda Tarix və coğrafiya fakültəsinin sosial media idarə heyətinin və fakültə könüllülərinin rəhbəri, ADPU-nun futzal və voleybol üzrə yığma komandaların üzvüdür.

Aktiv ictimai fəaliyyətinə görə universitet, müxtəlif dövlət və ictimai təşkilatlar tərəfindən "İlin tələbəsi", "İlin gənci" mükafatına, diplom, fəxri fərman və sertifikatları ilə təltif olunmuşdur.

Hal-hazırda da ictimai fəaliyyətini "İrəli" İctimai Birliyinin ali təhsil müəssisələri ilə iş üzrə baş koordinatoru kimi davam etdirir.

Tərlanın da yoldaşlarına tövsiyələri var: "Düşünürəm ki, öz inkişafım üçün ən ideal ali təhsil ocağını seçmişəm. "Ənənələrə sadiq, yeniliklərə açıq" şüarı ilə fəaliyyət göstərən universitetimizdə tələbələrin elmi, eləcə də ictimai fəaliyyəti üçün münbit şərait yaradılmışdır. Bunun nəticəsidir ki, ADPU-nun tələbə və məzunları ictimai sektorda öz nüfuzunu qoruyub saxlayır.İkili diplom, mübadilə proqramları və s. kimi şanslarla bir zamanlar mənimlə eyni auditoriyanı bölüşən tələbə dostlarımın bəziləri təhsillərini Avropanın nüfuzlu universitetlərində davam etdirir.

ADPU-da gələcəyin ixtisaslı müəllimi olaraq yetişməyiniz üçün yaradılan imkanlar və adındakı "Pedaqoji" sözü ixtisas seçən gənclər üçün böyük stimul yaratmalıdır. ADPU-da rəhbərlik və tələbələr arasında ünsiyyətin qurulması artıq çox asan bir prosesə çevrilib. Rəhbərlik tez-tez tələbələrlə görüşərək (xüsusilə I kurs tələbələri ilə) onların problemlərini dinləyir və dərhal adekvat tədbirlər həyata keçirir. Bu prosesdə Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin rolunu xüsusi vurğulamaq lazımdır. ADPU-nu seçən hər bir tələbə özünü bərabərhüquqlu ailənin üzvü hiss edə bilər.



**Xanəliyeva Gülnar**

2001-ci idə Bakı şəhərində anadan olmuşdur. 2018-ci ildə 83 saylı məktəb-liseydən məzun olaraq ADPU-nun Fizika fakültəsinin fizika müəllimliyi ixtisasına qəbul olunmuşdur.

Universitetə daxil olduğu ildən ADPU TGT-nin aktiv üzvü olmuş, müxtəlif vəzifələrdə fəaliyyət göstərdikdən sonra 2019-cu ilin dekabr ayında təşkilatın icraçı direktoru vəzifəsinə təyin olunmuşdur. Universitetdaxili və xarici bir çox dövlət əhəmiyyətli tədbirlərdə iştirak etmiş, daim inkişaf etməyə çalışmışdır. Bununla kifayətlənməyib, "ASAN Könüllüləri" və "DOST Könüllüləri" proqramlarına da qoşularaq vətəndaşlara xidmət edib, yüksək dərəcə ilə könüllülük fəaliyyətini başa vurmuşdur.

Uğurlu ictimai fəaliyyətinə görə 2019 və 2020-ci illərdə Universitet rəhbərliyi tərəfindən "İlin tələbəsi", 2021-ci ildə isə Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı (ATGTİ) tərəfindən "İlin TGT nümayəndəsi" adına layiq görülmüşdür.Həmçinin ADPU-nun 100 illiyinə həsr olunmuş təntənəli yubiley mərasiminin təşkilində könüllü kimi yaxından iştirak etmişdir.

Hal-hazırda IV kurs tələbəsi olan Gülnar deyir: "ADPU-da təhsil aldığım illər ərzində istər təhsil, istərsə də şəxsi inkişafla bağlı kifayət qədər irəlilədiyimi, aktiv ictimai fəaliyyətimə görə geniş təcrübə qazandığımı qeyd edə bilərəm.

Abituriyentlərə və tələbələrə tələbəlik illərində sadəcə təhsilə yönəlməyib, eyni zamanda özlərini ictimai sahədə də sınamağı tövsiyə edirəm."



**Musalı Esmira**

Bakı şəhərində anadan olub. Orta təhsilini Bakı şəhəri 80 nömrəli tam orta məktəbdə alan Esmira ADPU-nun Məktəbəqədər təhsil fakültəsinin korreksiyaedici təlim ixtisasının IV kurs tələbəsidir.

"Universitet mənə nə qazandırdı? Əvəzolunmaz dostluqlar, fəal sosial həyat, ixtisasımla bağlı təcrübə. Tələbələrə və abituriyentlərə məsləhətim: tələbəlik həyatınızı sadəcə təhsilə sərf etməyin. Mümkün olduğu qədər sosial həyatda da aktiv olmağa çalışın."

**Cəfərov Samir**



1997-ci ildə Cəlilabad rayonunda anadan olub. 2003-2012-ci illərdə Ş.Sultanov adına Qarazəncir kənd tam orta məktəbində təhsil alıb. 2012-ci ildə Maliyyə-İqtisad Kollecinə qəbul olunub.

2015-2017-ci illərdə hərbi xidmət keçdikdən sonra (Aprel döyüşlərinin iştirakçısıdır) 2018-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinə daxil olub. 2019-ci ilin oktyabr ayında ADPU YAP GB-nin Vətənpərvərlik klubuna sədr, həmin ilin dekabrında isə ADPU TGT-nin sədr köməkçisi vəzifəsinə seçilib. ADPU-dakı geniş ictimai fəaliyyətinə görə fəxri fərman, diplom və sertifikatlarla təltif olunmuş, "İlin tələbəsi" seçilmişdir.



**Səmədzadə Ceyla**

2001-ci ildə Bakı şəhərində dünyaya gəlib. 2018-ci ildə Suraxanı rayonu Əmircan qəsəbəsi 87 nömrəli tam orta məktəbi bitirmişdir. Elə həmin il 586 balla ADPU-nun Filologiya fakültəsinin Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasına qəbul olunmuşdur. IV kursda təhsil alır.

Təhsil aldığı müddətdə daim yüksək nəticələr göstərmişdir. 4 dəfə fakültə birincisi olmuş, bir dəfə Nizami Gəncəvi adına adlı təqaüdə layiq görülmüşdür. Fakültə rəhbərliyinin, müəllimlərin və tələbə yoldaşların böyük rəğbətini, sevgisini və hörmətini qazanmışdır. Ceylanın arzusu gələcəkdə təhsil aldığı universitetdə müəllim olmaqdır. O, dərsləri ilə birgə boş vaxtlarında ictimai işlərlə də məşğul olur. ADPU-nun 100 illik yubileyi ilə bağlı təntənəli tədbirin keçirilməsi və hazırlıq prosesində iştirak etmiş, təşkilat komitəsinin üzvü kimi mükafatlandırılmışdır.

Ceyla deyir: "Tələbəlik həyatımda və təhsilimdə qazandığım bütün uğurlara görə əvvəla ailəmə, sonra isə müəllimlərimə dərin təşəkkürünü bildirirəm. Fakültənin idarə edilməsində görülən işlər və inkişaf orada təhsil alan tələbə kontingentinin yüksək hazırlıqlı peşəkar kadr kimi yetişməsinə böyük töhvə verir. Müəllim olmaq arzusu olan bütün abituriyentlərin heç düşünmədən ADPU-nun filologiya fakültəsinə üz tutmalı olduqlarını düşünürəm. Yaradılan şərait və təhsil mühiti üçün başda rektor professor Cəfər Cəfərov olmaqla universitet və fakültə rəhbərliyinə təşəkkür edirəm."



**Quluzadə Nərgiz**

2002-ci ildə Bakı şəhərində anadan olmuşdur. 257 nömrəli tam orta məktəbi əla qiymətlərlə bitirmişdir. Məktəb dövründən ictimai fəal olmuş, məktəbin tədbirlərində yaxından iştirak etmişdir. Fənn olimpiadalarında "Azərbaycan dili və ədəbiyyat" fənni üzrə Bakı şəhəri üzrə ikinci yer tutmuşdur. Eyni zamanda məktəblilərarası intellektual yarışlarda da dəfələrlə yer tutmuş, məşhur "Fibonacci" intellektual oyunlarında da iştirak etmişdir. 480 balla ADPU-nun ibtidai sinif müəllimliyi ixtisasına qəbul olmuş Nərgiz hazırda SABAH qruplarında təhsil alır.

I kursdan etibarən universitetin rəsmi youtube kanalı-"ADPU TV"-də aparıcı olaraq könüllü fəaliyyət göstərmişdir. Eyni zamanda "ADPU Könüllüləri" Tələbə Birliyində sədr müavini vəzifəsində könüllü fəaliyyət göstərir.

Universitetin 100 illik yubiley mərasimində könüllü olaraq iştirak etmiş, rəhbərlik tərəfindən fəxri fərmanla təltif edilmişdir.

Nərgiz deyir: "ADPU mənə yaxşı dostlar, vicdanlı müəllimlər qazandırıb, burada əsl müəllim yetişdirmək istəyən, əlindən gələni əsirgəməyən, yüksək səviyyəli dərslər keçən müəllimlər var. Məhz bunun görə, ADPU-da təhsil aldığım üçün sevinirəm.

Abituriyent dostlara isə istədikləri ixtisasları seçmələrini, əgər müəllim olmaq istəyirlərsə, daha çox düşünmələrini,bu məsuliyyəti dərk etdikdən sonra qərar vermələrini tövsiyə edirəm.Bunu unutmayın, həyatı siz yaşayacaqsınız, seçdiyiniz ixtisas da sizin həyatınızın gedişini müəyyənləşdirir, ətrafdakı insanların deyil, özünüzün istədiyiniz ixtisası seçin və irəliləyin."



**Qurbanova Camilə**

2002-ci ildə Salyan rayonunda anadan olmuşdur.

İctimai-sosial fəaliyyəti hələ məktəb illərindən başlamışdır. Məktəb illərində bir çox bilik yarışlarının, müxtəlif müsabiqələrin qalibi olmuş, eyni zamanda Respublika Fənn Olimpiadasında (Kimya üzrə) üçüncü yer tutmuşdur.

2019-cu ildə ADPU-nun riyaziyyat və informatika müəllimliyi ixtisasına daxil olmuşdur. I kursda təhsil alarkən Tələbə Həmkarlar İttifaqı Komitəsinin (THİK) qrup meneceri seçilmiş və aktiv fəaliyyətinə görə 2021-ci ildə riyaziyyat və informatika müəllimliyi ixtisası üzrə sədr, qısa müddətdən sonra Riyaziyyat fakültəsi üzrə sədr seçilərək məhsuldar fəaliyyət göstərmişdir. Hazırda ADPU THİK sədr müavini olaraq fəaliyyətini davam etdirir.

"100 illik tarixə sahib bir universitetin tələbəsi olmaq və qazandırdıqları ilə fəxr etməmək qeyri-mümkündür. Universitet həyatı mənə təkcə təhsil, bilik deyil, eyni zamanda yeni dostluqlar,daha geniş dünyagörüşü,həyatım boyu unutmayacağım xoş tələbəlik xatirələri, ictimai sahədə geniş uğurlar, iş təcrübəsi və s. qazandırıb, qazandırmağa da davam edir.Sonda demək istəyirəm ki, bacarmaq üçün inanmalısınız. Uğurlar!"



**İmaməliyev Təhmasib**

2002-ci ildə Bakı şəhərində anadan olmuşdur. 2014-cü ildə Sumqayıt şəhər F.Əmirov adına musiqi məktəbinin tar şöbəsini, 2019-cu ildə Sumqayıt şəhər 11 saylı tam orta məktəbin rus bölməsini bitirmişdir. Hazırda ADPU-nun Tarix və coğrafiya fakültəsində tarix müəllimliyi ixtisası üzrə təhsil alır.II kurs tələbəsidir.

2020-ci ildən ADPU TGT-nin fəalları sırasına qoşulmuş, müxtəlif vəzifələrdə çalışmışdır.ADPU TGT sədr köməkçisi kimi ictimai fəaliyyətini davam etdirir.

Təhmasib Pedaqoji Universitetin 100 illik yubiley tədbirində, "Azərbaycan-Türkiyə Gənclərinin Beynəlxalq Zəfər Düşərgəsində" və s. iri miqyaslı tədbirlərdə iştirak etmiş, həmçinin "İçərişəhər" Dövlət Tarix-Memarlıq Qoruğu İdarəsi və ADPU birgə təşkilatçılığı ilə həyata keçirilən bir çox elmi-praktik konfranslarda əsas iştirakçılardan olmuşdur.

2022-ci ildə" 2 Fevral - Gənclər Günü" ilə bağlı keçirilən "Gənclər Forumu"nda Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevlə görüşdə iştirak etmişdir. Həmçinin universitetin 100 illik yubileyi ilə bağlı nəşr olunan "Pedaqoji Universitetin Qəhrəmanları" kitabının hazırlanmasında yaxından iştirak etmiş, "Tarix və coğrafiya fakültəsi 100 ildə" kitabında ictimai fəaliyyəti haqqında məlumat verilmişdir.

Fəaliyyəti müddətində bir çox Fəxri fərman, sertifikat və təşəkkürnamələrlə təltif edilmişdir.



**Kələşova Nigar**

2002-ci ildə Bakı şəhərində anadan olub. 2019-cu ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tarix və coğrafiya fakültəsinin tarix müəllimliyi ixtisasına qəbul olunub.

"Qeyd edim ki, valideynlərim də universitetimizin tarix müəllimliyi ixtisasını bitiriblər. Universitetə daxil olduğum vaxtdan etibarən ADPU YAP GB-nin sıralarına qoşularaq müxtəlif tədbirlərdə təşkilatçı qismində iştirak etmişəm. 2020-ci ildən etibarən ADPU YAP GB-nin fakültə sədr müavini, fakültə sədri və təşkilatın sədr müavini kimi vəzifələrdə çalışmışam. 2020-2021-ci illərdə ADPU Könüllüləri Tələbə Birliyinin sədr müavini vəzifəsinə çalışmışam. 2021-ci ildə ADPU-nun 100 illik yubileyinə həsr olunmuş yubiley mərasimində könüllü kimi təşkilat komitəsində iştirak etmişəm. Fəaliyyətimi yüksək qiymətləndirən universitet rəhbərliyi məni dəfələrlə fəxri fərman və təşəkkürnamələrlə təltif edib. Abituriyentlərə tövsiyəm odur ki, öz məqsədləri uğrunda mübarizə aparsınlar, tələbə olduqları dövrdə istər elmi, istərsə də ictimai fəaliyyətdə aktiv olsunlar."



Ramazanova Dünya

2003-cü ildə Bakı şəhərində anadan olmuşdur. 2008-2019-cu illərdə Suraxanı rayonu 278 saylı tam orta məktəbdə təhsil almışdır. Məktəbli dövründə məktəb və rayon səviyyəli tədbir və layihələrdə fəal iştirak etmiş, "İlin oxuyucusu" seçilmiş, nümunəvi davranışına və təhsil göstəricilərinə görə fəxri fərmanla təltif edilmiş, "Ölkəmizi tanıyaq" tur-aksiyasında Suraxanı rayonunu təmsil edən şagirdlərdən olmuşdur.

2019-cu ildə ADPU-nun ibtidai sinif müəllimliyi ixtisasına daxil olmuşdur. Əvvəlcə ADPU YAP GB-də qrup meneceri (2019) kimi ictimai fəaliyyətə başlayan Dünya müxtəlif vəzifələrdə çalışmışdır. Hazırda "ADPU Könüllüləri" Tələbə Birliyinin sədri (2022) kimi ictimai fəaliyyətini davam etdirir.

İctimai sahədəki fəaliyyətinə görə universitet rəhbərliyi tərəfindən fəxri fərmanlarla təltif edilmişdir. "ADPU-nun mənə ixtisas sahəsində müxtəlif bilik və bacarıqlar verməklə yanaşı təcrübə, kollektivlə işləmə, ünsiyyət və təşkilatçılıq bacarığı və geniş çevrə qazandırdığı deyə bilərəm.

Müəllimlik ixtisaslarında təhsil alan tələbələr ixtisaslarını sevərək, həvəslə öyrənməli və peşələrini uğurla icra etməlidirlər. İxtisasını sevməyən və həqiqətən də bu ixtisasda uğurlu olacaqlarını düşünməyən tələbələrimizə tövsiyəm edir ki, ixtisaslarını dəyişdirsinlər. Çünki bir millətin gələcəyi öz peşəsini istəyərək seçən, sevən və onu uğurla icra edən müəllimlərdən asılıdır."



Cəfərzadə Sultana

Azərbaycan Dövlət Pedaqoji Universitetinin IV kurs tələbəsidir. 2018-ci ildən beynəlxalq müsabiqələr laureatıdır. Universitetlərarası "Tarixin izləri"yarışmasının qalibi, 2019-cu ildə Belçikanın Gent Universitetində keçirilən "Creative Education" proqramının məzunudur. 2020-ci ildə Mədəniyyət Nazirliyinin Təcrübə proqramında iştirak etmişdir. 2021-ci ildə ADPU Təhsil Könüllüləri İctimai Birliyininəvvəlcə sədr müavini, ardınca isə sədri seçilmişdir.

Universitet rəhbərliyi tərəfindən "İlin tələbəsi" adına layiq görülmüşdür.

"Tələbələrə məsləhətim bu ola bilər ki, təhsillərini öndə tutmaq şərti ilə asudə vaxtlarında təcrübə qazansınlar, öz dillərini yaxşı mənimsəyib xaricə dillərə, beynəlxalq arenalara daxil olsunlar. Yeni dövr artıq ingilis dilindən belə önəmli dillərlə səciyyələnir. Xaricdə işə qəbul zamanı CV-də artıq ingilis dili yox,ingilis+çin, ingilis+italiyan dillər kimi dillər qeyd edilir. Bunun müsbət cəhəti ondan ibarətdir ki, tələbəlik vaxtında qazandığımız təcrübə, bilik ilə gələcəkdə yaxşı bir kadr, təcrübəçi olaraq inkişafımızı təmin edə bilərik.

Tələbələr ictimai fəaliyyətlə yanaşı, təhsilləri ilə ciddi məşğul olmalıdır ki, elm adamlarından faydalanaraq özlərinin və Azərbaycanın savadlı gələcəyini qura bilsinlər."



İsmayılov Raman

2002-ci ildə Lerik rayonunda anadan olmuşdur. 2020-ci ildə ADPU-nun Filologiya fakültəsinin ingilis dili müəllimliyi ixtisasına qəbul olunmuşdur.

Ali təhsil aldığı müddətdə Universitetin ictimai həyatında daima aktiv olmuş, ADPU rəhbərliyi tərəfindən çoxlu sertifikatlarla təltif olunmuşdur. 2021-ci ildən etibarən "Meh ədəbi dərnəyi"nin rəhbəri vəzifəsini icra edir.

Fəaliyyəti ərzində ölkəmizi və universitetimizi dəfələrlə beynəlxalq konfrans və müsabiqələrdə təmsil etmiş, nailiyyətlər əldə etmişdir. Bir çox elmi tezis və məqalələrin müəllifi olmuş, Təhsil Nazirliyi tərəfindən mükafatlandırılmışdır.

2021-ci ildə Türkiyədə Bədən Dili Akademiyasında özəl təlim alan Raman bu sahə üzrə mütəxəssis dərəcəsi-"udemy" sertifikatı ilə təltif olunmuşdur.

Raman deyir ki, Pedaqoji Universitetə qəbul olmaq onun hədəfi idi. Bu gün isə bu universitetin ona daha böyük hədəflər və onlara doğru addımlamaq üçün güc qazandırdığını, dəyərli müəllimlər, gözəl dostlar qazandırdığını qeyd edir. "Universitetimizdə təhsil alan bütün tələbələrə tövsiyə edirəm ki, burada onlar üçün yaradılan fürsəti dəyərləndirməyi bacarıb gəncliyinizi ən dəyərli şəkildə qiymətləndirin. Çünki zaman məhdududur. Dahi Nizami demiş-kən:

Həyat aləmidir hər şeydən üstün,
Cavanlıq günüdür ən qiymətli gün.
Həyatdan yaxşı şey dünyada nadir?!
Gənclikdən gözəl şey bir əfsanədir."



Əliyeva Aytən

2001-ci ildə Bakı şəhərində anadan olmuşdur. 2018-ci ildə Xətai rayonu 221 nömrəli tam orta məktəbi fərqləndirmə attestatı ilə bitirmişdir. Elə həmin il 531 balla ADPU-nunibtidai sinif müəllimliyi ixtisasına daxil olmuşdur. IV kurs tələbəsidir.

Universitetə daxil olduğu ildən etibarən ADPU TGT-də fəal tələbə olaraq bir sıra universitetdaxili və universitetdənkənar tədbirlərdə iştirak etmişdir. Hazırda TGT sədr müavini vəzifəsini icra edir. İbtidai sinif müəllimi olmağın uşaqlıq xəyalı olduğunu deyən Aytən ilk müəllimin gələcəyin həkim, müəllim, hüquqşünas və polisinin yetişməsinin təməlini qoyan şəxs olduğunu vurğulayır.

Universitetin sadəcə təhsil verməyib, dünyagörüşü, fəallığı, müəllimə olaraq necə vicdanlı, dürüst olmağı ona öyrətdiyini qeyd edir. Praktikada heç çətinlik çəkmədiyini, müəllimlərinin ona aşıladığı təhsil və biliklər sayəsində özünü gələcəyin müəllimi olaraq hazır hiss etdiyini deyir. Aytən müəllim olmaq istəyən gənclərə tərəddüd etməməyi tövsiyə edir: "Heç şübhə etmədən Azərbaycan Dövlət Pedaqoji Universiteti sayəsində xəyallarını gerçəkləşdirə biləcəklər. Universitet rəhbərliyi, fakültə dekanlığı, peşəkar müəllim heyəti sayəsində həm təhsil, həm də ictimai fəaliyyətində uğur qazanacaqlar.

Gələcəyin müəllimləri, sizin əsas hədəfiniz sadəcə mükəmməl müəllim olaraq yetişməyiniz deyil, peşəkar, öz işini və şagirdləri sevən, öyrətməyə həvəskar müəllim olaraq yetişməyinizdir. Əgər bunlar varsa hədəfinizə çatacaqsınız."



Abdullayeva Nazilə

Füzuli rayonunda anadan olub. ADPU-nun biologiya müəllimliyi ixtisasının III kurs tələbəsidir. "2019-cu ildə I kursa başladığım dövrdə dərslərimlə yanaşı fakültənin, universitetin elmi-ictimai işlərində fəal olmağı qarşıma məqsəd qoymuşdum.

Beləliklə, 2020-ci ildə "ADPU Enactus" komandasına qoşularaq fəaliyyətə başlamışam. 2 il komandada iştirak edərək kapitan köməkçisi vəzifəsini icra etmişəm.

2020-ci ildə ADPU YAP GB-də, daha sonra ADPU Könüllüləri Tələbə Birliyində fəaliyyət göstəmiş, mətbuat katibi vəzifəsini icra etmişəm.

ARDI 5-Cİ SƏHİFƏDƏ

2021-ci ilin dekabr ayında ADPU-nun 100 illiyində könüllü olaraq fəaliyyət göstərmişəm. Həmçinin universitetdə digər sahələrdə də könüllü fəaliyyət göstərirəm. 2020-ci ildə yaradılan ADPU SMM komandasının üzvüyəm. Eyni zamanda fakültə könüllüsü və mətbuat katibiyəm.

Bu fəaliyyətim dövründə bir çox layihələrdə iştirak etmişəm, sertifikat və nominasiyalarla təltif edilmişəm. 2020-ci ildə "İlin tələbəsi" nominasiyası, 2021-ci ildə Gənclər günündə Fəxri fərmanla təltif edilmişəm.

Təkcə universitetdaxili deyil, eyni zamanda universitetxarici könüllük fəaliyyətim olub, hal-hazırda da davam etdirirəm. AFFA, UEFA (EURO 2020), Formula 1 könüllüsü olmuşam.

Geriyə dönüb baxanda qazandığım bütün bu uğurlarımı gənclərə dəstək olan universitetimlə əlaqəndirirəm. Bələki, mən universitetə daxil olanda düşünmürdüm ki, nə vaxtsa universitetimi, ixtisasımı, bu qədər sevə bilərəm. Artıq III kurs tələbəsiyəm və bu gün əminliklə deyirəm ki, nə yaxşı ki ADPU!

Nə yaxşı ki, Kimya və biologiya fakültəsi!

Universitetə daxil olacaq bütün tələbələrə deyə bilərəm ki, yeni bilik və bacarıqlarla yanaşı universitetin ictimai-təşkilati işlərində də aktiv olsunlar, vaxtlarını düzgün dəyərləndirsinlər. Çünki geriyə baxanda, aldığımız təhsillə yanaşı gələcəyimiz üçün bu da olduqca önəmlidir."



**Qasımlı Aytac**

2002-ci ildə Bakı şəhərində anadan olmuşdur. Suraxanı rayonu 316 saylı tam orta məktəbdən məzun olmuşdur. Məktəb illərindən ədəbiyyat fənninə xüsusi marağı, sevgisi olub. Məktəblər, rayonlararası şeir, esse müsabiqələrində iştirak edərək bir neçə uğura imza atıb.

2019-cu ildə ADPU-nun Filologiya fakültəsinə daxil olmuşdur. Hal-hazırda Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisası üzrə təhsil alır. Fakültədə fəaliyyət göstərən MEH ədəbi dərnəyinin aktiv üzvlərindən biri kimi universitetin sosial həyatında da yaxından iştirak edir.

Aytac bildirir ki, ADPU-da tələbələrin inkişafı üçün geniş imkanlar təqdim olunur. Tələbələrə bu imkanlardan yararlanmağı, təhsil almaqla yanaşı, həm də bacarıqlarını inkişaf etdirməyi tövsiyə edir.



**Mahmudlu Mirniyaz**

2002-ci ildə Yardımlı rayonunda anadan olmuşdur. Yardımlı rayon 1 saylı tam orta məktəbini bitirmişdir. VIII sinifdə Biologiya üzrə keçirilən olimpiadada zona birincisi olmuşdur.

2019-cu ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin kimya müəllimliyi ixtisasına daxil olmuş və həmin ilin dekabrında ADPU THİK-də Kimya və biologiya fakültəsi üzrə sədr seçilmidir. 2021-ci ildə Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin yaranmasının 100 illiyi münasibətilə "Yubley Döş nişanı" ilə təltif olunmuşdur. Universitet rəhbərliyi tərəfindən bir neçə dəfə fəxri fərmanla təltif edilmişdir.

"Azərbaycan Dövlət Pedaqoji Universitetimənə inam və gələcəyə qətiyyətlə addımlamağı öyrədib. Eyni zamanda məqsədlərindənheç bir zaman geri çəkilməməyi başa salıb. Tələbə yoldaşlarıma demək istəyirəm ki, heç bir zaman məqsədinizdən geri durmayın və məqsədsiz olmayın. Çünki məqsədsiz insan öz yolunu heç zaman işıqlandıra bilməz. Həmçinin abituriyentlərdə bizim universitetimizi seçməklə ən doğru qərar vermiş olarlar. Burada olan yüksək təhsil, tələbə hazırlığı, universitetimizin xarici universitetlərlə apardığı ikili diplom proqramları da buna bariz nümunədir."

**Mirzəzadə Səkinəxanım**



2001-ci ildə Siyəzən şəhərində anadan olmuşdur. 2007-2018 ci illərdə Siyəzən şəhər M.Müşviq adına 2 saylı tam orta məktəbdə təhsil almışdır. 2018-ci ildə Pedaqoji Universitetin Filologiya fakültəsinə qəbul olunmuşdur. Universitetə başladığı ilk günlərdən ADPU THİK, ADPU TGT və ADPU YAP GB-nin müxtəlif layihələrində iştirak edərək ilk uğurlarını əldə etmişdir.

2020-ci ildən Filologiya fakültəsinin THİK sədri və ADPU THİK sədr müavinliyi vəzifələrində fəaliyyət göstərmişdir.

2021-ci ildə ATİAHİK RK-nin yaranmasının 100 illiyi münasibətilə "Yubiley Döş Nişanı" ilə, universitetin ictimai həatında xüsusi aktivliyinə görə isə fəxri fərmanlarla təltif olunmuşdur. Səkinəxanım deyir: "Universitet yeni uğurlar, nailiyyətlər qazandırması ilə yanaşı əvəzolunmaz biliklər qazandırır, müəllimlik sənətinin ən dərinində yerləşən qapılarının açarlarını bizlərə öz əllərilə verən müəllimlər sayəsində bu gün gələcəyə inamla addımlayıram. Məhz rəhbərliyimizin xüsusi diqqəti, universitetimizin təmin etdiyi yüksək təhsili, müəllimlərimizin əvəzedilməz əziyyətinə görə bir daha seçim etmək şansı olsaydı, yenə də ADPU-nu seçərdim."



**Haqverdiyev İlkin**

Ağdam rayonunda dünyaya gəlib. Orta məktəbi bitirdikdən sonra Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarix müəllimliyi ixtisasına qəbul olunan İlkin hazırda II kurs tələbəsidir. Həm universitetin ictimai təşkilatlarında, həm də bir neçə könüllü birliklərdə fəaliyyət göstərir. İctimai fəaliyyətində xeyli nəaliyyətlər əldə edib.

"Biz tələbələrə bu şansı yaratdığı üçün ADPU heyyətinə xüsusilə minnətdaram. Son iki il müddətində həyatımda inanılmaz dəyişiklikləri görmək mümkündür. Çox şadam ki, həm gözəl dostlar qazanmışam, həm də təcrübə toplamış və maariflənmişəm. Bizdən sonra gələn abituriyentlərə məsləhətim odur ki, sizin də seçiminiz ADPU olarsa, gələcək məqsədləriniz üçün düzgün bir addım atmış olacaqsanız."




**Babaşov Əhmədağa**

İmişli şəhərində anadan olub. Orta təhsilini İmişli şəhər N.Şirinov adına 5 saylı texniki təmayüllü məktəb-liseydə alıb. Məktəbi bitirdikdən sonra Azərbaycan Dövlət Pedaqoji Universitetinin Filologiya fakültəsinin ingilis dili müəllimliyi ixtisasına qəbul olunub.

"Universitetdə oxuduğum müddətdə ictimai fəaliyyətimlə uğurlar qazanmışam. Eyni zamanda, universitetimizin hər zaman öz müəllim heyəti və rəhbərliyi ilə mehribanlıq və digər müsbət məsələlərə görə fərqləndiyini qeyd etmək istəyirəm.

Daha yaxşı bir gələcək və kariyera üçün abituriyent dostlarımıza universitetimizdə təhsil almağı tövsiyə edirəm."



**Mirzəyeva Səbinə**

İsmayıllı rayonunda anadan olmuşdur. Hal-hazırda Pedaqoji Universitetin IV kurs tələbəsidir. Həmçinin ADPU TGT-nin meneceri kimi fəaliyyət göstərir, əlavə olaraq jurnalistika sahəsi üzrə sertifikata sahibdir.

Tələbəlik illərinin bir ömürə sığmayacaq qədər gözəl xatirələrlə dolu olduğunu və ən əsası universitetdə oxumağın gələcək planlarının bir hissəsini reallaşdırdığını qeyd edir. Tələbəlik həyatı, ailədən uzaq yaşamağın bəzi çətinliklər gətirdiyini, lakin onların öhdəsindən gəlməyi də öyrətdiyini qeyd edir. Oxuduğu fənnlərin həyat haqqında biliklərini daha da dərinləşdirdiyini, artıq əvvəlki düşüncə tərzinin yenisi ilə əvəzləndiyini qeyd edir. Qazandığı dostluqların, qoşulduğufərqli qrupların hər birinin yeniliklər gətirdiyini qeyd edir.

Abituriyentlərə isə bir neçə tövsiyyəsi vardır: "Öz həyatlarınızı universitetə hazırlaşmaq qərarına uyğun olaraq planlı və məsuliyyətli şəkildə qurmağı, sosiallaşmağı, universitet hazırlıqlarına görə ayırdıqları vaxtı dərsə həsr etmək əvəzinə, həyat tərzlərini universitet həyatına görə uyğunlaşdırmağı tövsiyə edirəm. Tələbə adını qazandıqdan sonra isə, həm dərslərində uğurlar qazanmağa, həm aktiv olmağa, həm də sosial qruplarda iştirak etməyi tövsiyə edirəm."




**Məmmədzadə Əli**

2000-ci ildə Bakı şəhərində anadan olmuşdur. Məktəb illərində bir çox müsabiqələrdə, Respublika Fənn Olimpiadasında fəal iştirak etmişdir. Orta məktəbi fərqlənmə ilə bitirərək 2018-ci ildə ADPU-nun Tarix və coğrafiya fakültəsinin coğrafiya müəllimliyi ixtisasına qəbulolunmuşdur.

Universitetdə təhsil və ictimai sahədə fərqlənərək 2020-ci ildə coğrafiya müəllimliyi ixtisasında ÜOMG-yə görə birinci olaraq Qafur Rəşad Mirzəzadə adına adlı təqaüdə, 2021-ci il isə ADPU üzrə ən yüksək akademik göstərici əldə edərək ümummilli lider Heydər Əliyev adına adlı təqaüdə layiq görülmüşdür. 2021-ci ildə ADPU TV-də aparıcı kimi fəaliyyət göstərmişdir.

Uğurlu 4 il ərzində 30-a yaxın konfransda (ikisi beynəlxalq) iştirak etmişdir. 4 məqalənin müəllifidir və 25-ə yaxın sertifikat (habelə IELTS sertifikatı), diplom və fəxri fərman almışdır.

Magistr təhsilini xaricdə davam etdirməyi düşünən Əli hazırda 10-a yaxın xarici ölkə universitetlərindən qabaqcadan qəbul alaraq Visegrad, Stephan Banach, Litva beynəxalq təqaüd proqramlarına müraciət etmişdir. "Bir ADPU tələbəsi olaraq gələcək kariyerasında uğur qazanmaq istəyən hər bir abituriyentə yeniliklərə açıq, ənənələrə sadiq olan ixtisas seçimi zamanı ADPU-ya üstünlük vermələrini tövsiyə edirəm. Dörd illik tələbə həyatının uğurlu və məqsədli şəkildə olması, təhsildə sağlam rəqabət aparması üçün geniş imkanlar yaradan 100 illik tarixə malik olan ADPU hər bir tələbənin qəbul olmaq istədiyi universitet olmalıdır. Uğurun sirri məqsədə sadiq qalmaqdırsa, bu halda məqsədinizə ADPU-nu seçərək sadiq qalın."



**Baba Əlibabaoğlu**

1998-ci ildə Zərdab rayonunda anadan olmuşdur. 2005-2016-cı illərdə Gəndəbil kənd tam orta məktəbində təhsil almışdır. Eyni zamanda 2007-2012-ci illərdə Zərdab rayonunda musiqi məktəbində oxumuş və məktəb illərində müntəzəm olaraq şahmat yarışlarında iştirak edərək ikinci dərəcə almışdır.

2016-cı ildə ADPU-nun Filologiya fakültəsinə daxil olmuş və 2020-ci ildə fakültəni fərqlənmə diplomu və birinciliklə bitirmişdir. 2020-ci ildə ADPU-nun "Azərbaycan dili və ədəbiyyatının tədrisi metodikası və metodologiyası" ixtisasına daxil olmuşdur. Hazırda ikinci tədris ilinin magistrantıdır.




**Qarayev Anar**

2002-ci ildə Yevlax rayonunda anadan olub. Orta təhsilini Yevlax rayonu Ərəş kənd tam orta məktəbində aldıqdan sonra 2019-cu ildə ADPU-ya qəbul olunub. Tələbəlik dövründə bir neçə gənclər təşkilatlarında və ictimai birliklərdə fəaliyyət göstərib. Bu təşkilatlardakı fəaliyyət istiqamətləri əsasən gənclər arasında vətənpərvərlik, milli-mənəvi dəyərlərimizin, tariximizin və mədəniyyətimizin təbliği sahəsində müxtəlif layihələr həyata keçirmək və bu kimi layihələrin iştirakçısı olmaq olmuşdur. Hazırda isə ADPU-nun Tələbə Elmi Cəmiyyəti sədrinin birinci müavidir.

"Universitet insanın sosiallaşmasına, ictimai proseslərdə aktiv iştirakına, savadlı və ixtisaslı kadr kimi yetişməsinə əsaslı şəkildə təsir göstərir. Mənim üçün Pedaqoji Universitet çox doğmadır. İctimai fəal kimi yetişməyimdə, təşkilatçılıq qabiliyyətimin formalaşmasında, dünya görüşümün və təfəkkürümün inkişafında ADPU-ya, müəllimlərimə və dəyərli ziyalılarımıza borcluyam.

Universitet illəri insan ömrünün ən gözəl çağlarıdır. Tələbə yoldaşlarıma və gələcəyin tələbələri olacaq abituriyentlərə tövsiyəm ondan ibarətdir ki, mövcud şərtlərdən, problemlərdən asılı olmayaraq təhsil aldıqları ali təhsil müəssisəsində daim ziyalılar ilə əlaqədə olsunlar. Bundan başqa təhsil və elm sahəsindəki yenilikləri öyrənsinlər. Ən əsası isə beynəlxalq təcrübəni öyrənib ölkəmizdə tətbiq etsinlər. Ulu öndər Heydər Əliyevin dediyi kimi "Təhsil millətin gələcəyidir". Biz gənclər daha savadlı, intellektual, müasir olmalıyıq. Daim öz üzərimizdə çalışmalıyıq. Azərbaycanımızın gələcəyi biz gənclərin əlindədir".



**Hüseynova Gülçiçək**

2001-ci ildə Astara rayonunda dünyaya gəlib. 2018-ci ildə Kakalos kəndi C.Cabbarlı adına tam orta məktəbdən məzun olub. Gülçiçək deyir ki, valideynlərimin əziyyəti, müəllimlərimin dəstəyi və çalışqanlığım sayəsində 604 bal toplayaraq Pedoqoji Universitetə qəbul olunmuşam. Hazırda riyaziyyat və informatika müəllimliyi ixtisasının IV kurs tələbəsidir.

Yüksək balla müəllimlik ixtisasını seçdiyinə görə "Gələcəyin müəllimi" təqaüdü alır. 2021/2022-ci tədris ilinin payız semestrinin imtahan sessiyasında fakültə birincisi olaraq"akademik Zahid Xəlilov" adına adlı təqaüdə layiq görülüb.

"Bu şərəfli və bir o qədər məsuliyyətli peşəni seçməyimin əsas səbəblərindən biri Azərbaycan müəllimlərinin müstəqil respublikamızın intellektual potensialının formalaşmasında böyük rola malik olmasıdır. ADPU bu məqsədə nail olmaq, müəllimlik ixtisasına əsaslı yiyələnmək üçün yüksəkixtisaslı pedaqoji kadr hazırlığının özəyini təşkil edən, müxtəlif ölkələrə tələbə mübadiləsi və birgə elmi tədqiqatlar aparmaq, beynəlxalq və regional təhsil proqramlarına qoşulmaq və onlarda fəal iştirak etməyə şərait yaradan təhsil ocağıdır. Doğma universitetimiz mənə bütün bunlarla yanaşı həyatım boyu unutmayacağım, elmi ilə minlərlə zehni aydınladan dəyərli və qayğıkeş müəllimlər, öyrənməyi sevən, öyrənərək öyrətməyə hazır, mehriban tələbə yoldaşları, hər zaman sadiq qalacağım dostluqlar bəxş etdi. Buna görə özümü çox xoşbəxt hesab edirəm.

Tələbə yoldaşlarıma və abituriyentlərə demək istəyirəm ki, məqsədlərimizin bizə doğru yolu göstərdiyinə çox inanıram. Bu yolda zehni dinləndirməyi unutmadan çalışqanlıq, səbr və iradə bizi gec-tez bəlli məqsədə çatdıracaq. Əslində heç kim bizim üçün uğurun konkret reseptini verə bilməz. Öz reseptinizi ancaq siz bilirsiniz. Oxuyun və uğurlu insanları izləyin, ancaq nə etməli olduğunuzu, öz yolunuzu özünüz müəyyənləşdirin. Belə etsəniz, şəxsi uğur hekayənizi özünüz yazacaqsınız."



**Əkbərli Nəzrin**

2001-ci ildə Bakı şəhərində anadan olub. 2007-2018-ci illərdə Abşeron rayonu Görədil kəndi İ.Yusifov adına tam orta məktəbdə təhsil alıb. 2018-ci ildə 528 balla Azərbaycan Dövlət Pedaqoji Universitetinin İbtidai təhsil fakültəsinə qəbul olunub. II kursdan təhsilini SABAH qruplarında davam etdirir. Hal-hazırda Hədəf STEAM liseyində təcrübədədir.

"Universitet, xüsusən də, SABAH qruplarının müəllim kollektivi mənə ixtisasımın dərinliklərini öyrətdi. Peşəmə olan sevgim müəllimlərimin sayəsində daha da artdı. Əgər əvvəlcə kortəbii şəkildə sadəcə müəllim olmağı düşünürdümsə, indi necə müəllim olacağımı, fəal interaktiv təlim metodlarının mahiyyətini, onlardan istifadə qaydalarını bilirəm.

Abituriyentlərə demək istəyirəm ki, Azərbaycanın uğurlu gələcəyi biz gənclərdən asılıdır. Əgər biz sağlamlığımızı əmanət etdiyimiz həkimin, bizə təhsil verən müəllimin, evimizi inşa edən memarın, hüquqlarımızı qoruyan vəkilin, hətta dərzimizin belə işinin peşəkarı olmasını istəyiriksə, deməli ilk növbədə özümüz də təhsil aldığımız ixtisasın dərinliklərini bilməliyik. Sadəcə xəyal etmək və reallaşdırmaq üçün çalışmaq kifayətdir."



**Bayramova Pərvanə**

2000-ci ildə Ağstafa rayonunda anadan olmuşdur. Orta təhsilini M.Əhmədovadına Pirili kənd tam orta məktəbində almışdır.Məktəb illərində layihələrdə, yarışlarda, fənn olimpiadalarında iştirak etmiş, təhsilimi əla qiymətlərlə başa vurmuşdur.

2017-ci ildə 602 balla ADPU-nun Riyaziyyat fakültəsinin riyaziyyat və informatika müəllimliyi ixtisasına qəbul olunmuşdur.

Pərvanə deyir ki, müəllimlik peşəsinə yiyələnmək uşaqlıq arzusu olmuş və bu peşəni ən yaxşı öyrədəcək universitetin Azərbaycan Dövlət Pedaqoji Universiteti olduğuna qərar vermişəm.

"Seçimimdə yanılmadığımı düşünürəm. Çünki bu universitetdə sadəcə təhsil almaqla kifayətlənməyib ictimai təşkilatlara da üzv olmuş, bir çox sosial layihələrdə iştirak etmiş, yeni insanlar tanımışam.

Semestr imtahanlarını necə müvəffəqiyyətlə vermək olardeyə düşünən tələbələrə tövsiyə edirəmki, mövzuları zamanında öyrənsinlər və imtahana hazırlaşan zaman özlərinə uyğun vaxt bölgüsü ilə çalışsınlar. Müəllimlik kimi prestijli peşəyə yiyələnmək istəyən abituriyentlərə isə ürəkdən ADPU-nu məsləhət görürəm."



**Rəhimova Nübar**

2001-ci ildə Quba rayonunda anadan olmuşdur. 2018-ci ildə orta məktəbdən məzun olaraq ali məktəblərə keçirilən qəbul imtahanlarında 670 bal toplamış və Azərbaycan Dövlət Pedaqoji Universitetinin Quba filialının riyaziyyat və informatika müəllimliyi ixtisasına qəbul olunmuşdur. I kursu burada təhsil aldıqdan sonra ADPU-nun SABAH qrupları mərkəzinin riyaziyyat və informatika müəllimliyi ixtisasına qəbul olunmuşdur. Hazırda IV kurs tələbəsi olaraq SABAH qruplarında təhsilini davam etdirir.

Nübar qeyd edir ki, bəlkə də çoxları düşünə bilər ki, filiallarda təhsil səviyyəsi aşağı olur və ya burada tələbələrin özlərini inkişaf etdirmələri üçün imkan olmur. Amma Quba filialında oxuduğu 1 il ərzində bu fikirlərin doğru olmadığını öyrəndiyini vurğulayır. Oradakı müəllimlərin həqiqətən öz sahələrində söz demiş, sayılıb-seçilən insanlar olduğunu, rəhbərliyinisə daim tələbələrin yanında olaraq onlara dəstək verdiyini deyir. Lakin SABAH qrupları yalnız Bakıda olduğu üçünoradan ayrılmalı olduğunu qeyd edir.

Bakıya gəlmədən öncə çoxlu tərəddüdlərinin olduğunu, lakin universitet rəhbərliyi və SABAH ailəsinin diqqətcil, qayğıkeş münasibəti ilə verdiyi qərarda yanılmadığını gördüyünü vurğulayır.

Bir çoxlarının onun yüksək balla bu ixtisası seçməsinin səhv olması düşüncəsinə cavab olaraq Nübar deyir: "Müəllimlik "balım filan ixtisasa çatmadı, müəllimliyi seçdim" ifadəsinə layiq olmayacaq qədər ali bir peşədir. Müəllimlik elə bir peşədir ki, əksinə daha yüksək nəticə göstərmiş abituriyentlər bu ixtisası seçməlidirlər. Çünki gələcəyimiz məhz onların yetişdirdiyi nəsildən asılıdır.Odur ki, abituriyentlərə demək istəyirəm ki, ixtisas seçimi mərhələsində hər kəs onlara müxtəlif məsləhətlər verəcək və hər kəs də özünü haqlı hesab edəcək. Lakin onlar öz xəyallarının ardınca getməli, gələcəkdə özlərini görmək istədikləri, özlərini ona aid hiss etdikləri peşəni seçməlidirlər ki, bir gün geriyə baxıb peşman olmasınlar."



**Rəcəbova Gülyanaq**

Şəki rayonunda anadan olmuşdur. 2007-2018-ci illərdə Köndələn kənd tam orta məktəbində təhsil almışdır. 2018-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin məktəbəqədər təlim və tərbiyə ixtisasına qəbul olunmuşdur. Təhsil aldığı 4 il ərzində fakültədə ümumi orta müvəffəqiyyət göstəricisinə (ÜOMG) görə 3 dəfə birinci olmuşdur.

Ailəsi və müəllimlərinin onu həmişə dəstəklədiyinə görə onlara minnətdar olduğunu bildirən Gülyanaq deyir: "Uğura gedən yol təkcə çox oxumaqdan keçmir, tələbə gərək aktiv fəaliyyət göstərib təcrübə əldə etsin. Bu 4 il ərzində mən də, oxumaqla bərabər ADPU TGT-nin Elm və Təhsil klubunun aktiv üzvü olmuşam.

Həmçinin müəllimlərimin rəhbərliyi ilə elmi fəaliyyətlə məşğul olmuşam, konfranslarda iştirak edərək tezislərini təqdim etmişəm. Bununla bərabər rəsm və şeir müsabiqələrinə qatılmış, mükafatlarla təltif olunmuşam.

Savadlı və qayğıkeş Universitet kollektivi hədəflərimə çatmaqda əvəzsiz rol oynadı. Bütün öyrəndiklərim və qazandıqlarıma görə Pedaqoji Universitetin rəhbərliyi və müəllim heyətinə minnətdarlığımı bildirirəm.

Bütün gənclərimizə məsləhət görürəm ki, arzuları uğrunda mübarizə aparsınlar. ADPU-da təhsil aldığım müddətdə şəxsən əmin oldum ki, bizim elm ocağımız, alimlərimiz və təhsilimiz bəzi xarici ölkələrdən də irəlidədir. Gələcəyimiz elmin inkişafından asılıdır."



**Ramazanova Məryəm**

Xaçmaz rayonunda anadan olmuşdur. 2020-ci ildə BDU-nun biologiya fakültəsini fərqlənmə diplomu ilə bitirmişdir. 2017-2020-ci illərdə Zərifə Əliyeva təqaüdçüsü olmuşdur. BDU-da təhsil aldığı dövrdə "İlin tələbəsi" mükafatına layiq görülmüşdür. Tələbə Elmi Cəmiyyətində "Bitki hüceyrəsi ikiqat simbiozun nəticəsidir" adlı elmi seminar keçirtmişdir.

Hazırda ADPU-nun ikinci kurs magistrantıdır. Üç məqaləsi (biri ingilis dilində), 1 tezisiçap olunub. ADPU-da "Sitologiya, genetika, seleksiya" adlı konfransda "Kök hüceyrələri" mövzusunda çıxış etmişdir.

Elmi-tədqiqat yolunda irəliləyən Məryəmin də yoldaşlarına sözü var: "Bu gün elm və texnikanın inkişafı savadlı, bacarıqlı kadr hazırlığını tələb edir. İstənilən halda kadr hazırlığının ilk mərhələsi təhsil müəssisələridir. Bunun üçün də təhsil müəssisələrində çalışan müəllimlər yeni texnologiyalar ilə işləməyi bacaran, daim yeni biliklər əldə edən olmalıdır. Belə müəllimlərin yetişməsində ADPU-nun rolu əvəzsizdir. ADPU-da çalışan professor-müəllim heyətinin verdiyi biliklər mənə fəaliyyətimdə yol göstərib. Tələbə və magistrantlara bu istiqamətdə işləmələrini, fasiləsiz öyrənmə və öyrətməni həyata keçirmələrini məsləhət görürəm."



**Qarayeva Sevinc**

2000-ci ildə Beyləqan rayonunda doğulmuşdur. 2018-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin təsviri incəsənət müəllimliyi ixtisasına qəbul olunmuşdur. Məktəb və universitet illərində rəsm üzrə uğurlara nail olmuşdur.
Məktəb illərində müxtəlif sosial-ictimai, vətənpərvərlik mövzularında keçirilən respublika və yerli rəsm müsabiqələrində əsərləri birinci yerə layiq görülmüşdür. Sevincin ADPU-da təhsil aldığı dövrdə qazandığı uğurlar isə təkcə ölkəmizlə məhdudlaşmır. Pandemiya olmasına baxmayaraq, 2021-ci ildə Türkiyə Cümhuriyyətində "23 Nisan Ulusal Egemenlik və çocuk Bayramı" və "19 Mayıs Atatürkü Anma və Spor Bayramı"münasibəti ilə təşkil olunan beynəlxalq qarışıq incəsənət sərgilərin də sertifikatla təltif olunmuşdur. Təhsil aldığı müddətdə ADPU-nun tələbə təşkilatları tərəfindən təşkil olunan bir neçə incəsənət müsabiqəsində birincilik qazanmış, sertifikatlarla təltif olunmuşdur. Sevinc onun üçün ən qürurverici sərginin isə Vətən müharibəsində qazandığımız parlaq qələbənin 1 ilinin tamam olması ilə əlaqədar Sumqayıt şəhərində keçirilən "Zəfər Palitrası" sərgisi olduğunu vurğulayır. Təkcə ictimai fəaliyyətlə kifayətlənməyən IV kurs tələbəsi semestr imtahanlarında da yüksək nəticə toplayaraq həm qrup, həm də fakültə üzrə fərqlənmişdir. "Gələcəkdə ixtisas və peşə seçimi etməli olacaq abturiyentlərə demək istəyirəm ki, sevdiyiniz peşəyə yiyələnin. Uğur qazanmağın yolu məhz bundan başlayır."



**Məmmədova Hökümə**

2001-ci ildə Neftçala royonunda anadan olmuşdur. ADPU-nun Fizika fakültəsinin texnologiya müəllimliyi ixtisasının IV kurs tələbəsidir. Universitet illərində semestr imtahanlarını həmişə uğurla başa vurmuş və son 2 semestrdə isə fakültə üzrə ən yüksək ÜOMG toplayaraq akademik Həsən Abdullayev adına təqaüdə layiq görülmüşdür. 2021-ci ilin yaz smestrində təhsildə göstərdiyi nəaliyyətlərə görə "2 Fevral - Gənclər Günü"ndə universitet rəhbərliyi tərəfindən Fəxri fərmana layiq görülmüşdür. Bunlardan əlavə elmi-tədris fəaliyyətinə, konfranslarda iştirakına görə sertifikat və diplomlarla təltif olunmuşdur. Hökümə deyir ki, təhsil hər zaman hamı üçün olduqca vacibdir. Tələbəlik illərində bunu bir daha anladım, çünki bu 4 il ərzində universitetmənə yüksək təhsil, eyni zamanda geniş dünyagörüşü qazandırıb. Həyatda qazanacağımız hər bir uğur öz əlimizdədir, yetər ki biz özümüzə inanıb, qarşımıza hədəf qoyub o hədəf uğrunda hər zaman əlimizdən gələni edək.
"Abituriyentlərə məsləhətim odur ki, qarşılarına məqsəd qoyub inamla o məqsədə doğru addımlasınlar, çünki bunu heç kəs üçün yox, öz gələcəkləri üçün edirlər. Bəlkə bu yolda yanınızda olub dəstək verən olmasa da, biz təslim olub əl çəkməli deyilik. Xüsusən də, qızlar üçün təhsil hər zaman vacibdir, dünyagörüşümüz artdıqca bunun canlı şahidi oluruq.
Universitetimiz haqqında isə onu qeyd etmək istəyirəm ki, tələbələrə yüksək təhsil verir, semestr imtahanlarını şəffaf formada təşkil edir, hər zaman oxuyan tələbələrin yanında olur."



**Əmrahlı Nursu**

Şəmkir şəhərində anadan olmuşdur. 2007-2018-ci illərdə orta təhsilini rus bölməsi üzrə almışdır. 2010-2017-ci illərdə fortepiano üzrə musiqi məktəbini fərqlənmə ilə bitirmişdir. 2018-ci ildə ADPU-nun Tarix və coğrafiya fakültəsinin tarix muəllimliyi ixtisasına daxil olmuşdur. Nursu deyir: "Tələbəlik illəri mənə çox şey qazandırıb. Belə ki, savadlı müəllimlərdən dərs almaq fürsəti əldə etdirib ki, onun əvəzi olmayacaq. Gözəl düşüncəli insanlar tanıtdırıb. Qısaca, həyata daha fərqli pəncərədən baxmağı öyrədib. Təhsil almaqla yanaşı müxtəlif tədbirlərdə və seminarlarda iştirak edib faydalanmış, çalışmışam ki, öyrəndiklərimi həyatıma tətbiq edim. Tələbə olmaq istəyən abituriyentlərimizə ixtisas seçərkən diqqətli olmağı və yalnız özlərini görmək istədikləri peşədə ixtisaslaşmağı tövsiyə edirəm. Bu zaman sürətlə irəliləyib istədikləri uğura nail ola bilərlər. Unutmayaq ki, sadəcə seçdiyimiz peşəni sevərək digərlərinə sevdirə bilərik."



**Nağıyeva Şəbnəm**

2001-ci ildə Goranboy rayonunda anadan olmuşdur. 2008-2019-cu illərdə Tapqara- qoyunlu kənd tam orta məktəbində təhsil alan Şəbnəm dəfələrlə məktəb rəhbərliyi tərəfindən təşəkkürnamə və fəxri fərmanla təltif olunmuşdur.
2019-cu ildə 550 balla ADPU-nun Filologiya fakültəsinin Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasına qəbul olunub. I kursun sonunda ən yüksək ÜOMG qazandığına görə yeni yaradılan eksperimental qrupun qrup nümayəndəsi, 2020-2021-ci tədris ilinin payız semestrində qazandığı yüksək akademik göstəricilərə görə ADPU YAP GB-nin "Əlaçılar" klubunun sədri seçilmişdir.
2020-2021-ci tədris ilinin yaz semestrində və 2021-2022-ci tədris ilinin payız semestrində imtahanlarda 100 bal toplayaraq ÜOMG üzrə fakültə birincisi olmuş və iki semestr ardıcıl olaraq "Nizami Gəncəvi" adına adlı təqaüdə layiq görülmüşdür.
"ADPU mənim onun üçün əvəzolunmaz bir universitetdir. İstər təhsili, istərsə də hər zaman tələbələrin yanında olan müəllimləri ilə ölkənin ən mükəmməl təhsil ocaqlarından biridir. Xüsusilə də filologiya fakültəsində tələbənin həmişə diqqət mərkəzində saxlanıldığını və tələbəyönümlü yeni modellər tətbiq olunduğunu qeyd edərdim. Doğrudur, bəzən çətinliklərlə qarşılaşırıq, başqa cür fikirləşirik, ammabu 3 ilin sonunda deyə bilərəm ki, yaxşı ki, bu universiteti və fakültəni seçmişəm.Bütün uğurlarımı iradə, səbr, çox çalışmaq, və əzim sayəsində qazanmışam. Tələbələrədə tövsiyə edirəm ki, heç vaxt problemlərdən, çətinliklərdən qorxmasınlar, daim irəlidə olmaq arzusu ilə yaşasınlar. Siz əlinizdən gələni edin, sonda uğur özü gəlib sizi tapacaq."



**Nəcəfova Fatimə**

2001-ci ildə Bakı şəhərində anadan olmuşdur. Orta təhsilini Humanitar fənlər təmayüllü liseydə almış və 2018-ci ildə ADPU-nun Kimya və biologiya fakültəsinin biologiya müəllimliyi ixtisasına qəbul olunmuşdur.
"Universitet mənim dünyagörüşümü inkişaf etdirib. Cəmiyyət üçün yararlı kadr kimi formalaşmağıma təsir göstərib. Dostluğun həyatda əsas göstəricilərdən biri olduğunu başa salıb. Abituriyentlərə deyə bilərəm ki, hər zaman öz istəklərini ön planda tutsunlar. Valideynlər onlar üçün hər şeyin ən yaxşısını istəsə belə, onların istəmədikləri peşə seçimi həyatlarını dəyişə bilər. Ona görə də, hər zaman öz məqsəd və xəyallarının ardınca getmələrini məsləhət görərdim."



**Əliyeva Yaman**

Məktəbəqədər təhsil fakültəsinin II kurs tələbəsidir. "Erasmus+ mübadilə programı ilə bu ilin yaz semestri üçün Kopenhagen şəhərinin UCC Universitetində təhsil alıram. Azərbaycanda olarkən müxtəlif müəssisələrdə fəaliyyət göstərmişəm, vaxtımın çox hissəsini isə uşaq profili üzərində işləyərək keçirmişəm.
Danimarkada və digər ölkələrdə müşahidə etdiyim müxtəlifliklər məni hər iki mühitlə əlaqəli müqayisələr aparmağa və analizlər etməyə gətirib çıxardı. Azərbaycanda edəcəyimiz və etməli olduğumuz çox şeylər var və bunu realizasiya etmək üçün resurslar tapmağa çalışıram. Və xaricdə təhsil almaq istəyən tələbələrə deyəcəyim tək bir cümlə var: Sadəcə gəlin və müşahidə edin. Bura ilə bağlı oxuyaraq, videolara baxaraq ya da insanlarla danışaraq anlaya bilməzsiniz, məhz özünüz təcrübə etməlisiniz. Çünki bir obyekt müxtəlif insanların üzərində müxtəlif təsirlər bağışlaya bilər və mənim qavradığım subyektiv fikirlərimdən çox sizin bura gəlib öz fikirlərinizi formalaşdırmağa ehtiyacınız var. Uğurlar arzu edirəm hər bir tələbə üçün!"



**Məmmədli Məlahxatun**

2001-ci ildə Bakı şəhərində anadan olmuşdur. 2018-ci ildə 83 nömrəli məktəb-liseyi bitirdikdən sonra Azərbaycan Dövlət Pedaqoji Universitetinə daxil olub. İncəsənət və fiziki tərbiyə fakültəsinin Təsviri incəsənət müəllimliyi ixtisasında təhsil alır.

Hələ orta məktəbdə oxuyarkən müxtəlif sərgilərdə iştirak etmiş və Binəqədi rayonu üzrə üçüncü yerə layiq görülmüşdür. Universitetə daxil olduqdan sonra Azərbaycan Rəssamlar İttifaqında hər il keçirilən "Gənc Rəssamlar" sərgisində iştirak edir.

Məlahxatun deyir ki, onun qazandığı uğurlarda ADPU-nun müəllimlərinin zəhməti böyükdür. Onlardan çox şey öyrənib. Müəllimləri tələbələrin yaxşı rəssam kimi yetişməyi üçün əllərindən gələni əsirgəmirlər. "Universitetimizə daxil olmaq arzusunda olan abituriyentlərə uğurlar arzu edirəm və dərsə qarşı məsuliyyətli olmaqlarını, dərslərdə, sərgilərdə aktiv iştirak etmələrini məsləhət görürəm."



**Göyüşlü Nəzrin**

2001-ci ildə anadan olub. Əslən Cəbrayıl rayonu Böyük Mərcanlı kəndindən olan Nəzrin orta təhsilini Cəbrayıl rayonu R.Xudiyev adına Minbaşılı kənd tam orta məktəbində alıb.Məktəb illərində fəxri fərmanla təltif olunub, intellektual oyunlarda iştirak edib. 2018-ci ildə ADPU-nun Fizika müəllimliyi ixtisasına qəbul olunub. 2019-cu ildən etibarən ÜOMG əsasında eksperimental qrupda qrup nümayəndəsi olaraq təhsilini davam etdirir.

ADPU TGT-də göstəriyi fəaliyyətə görə "ayın ən aktiv tələbəsi" sertifikatıyla təltif olunub.

2019-cu ildə "I İnternational STEM in Hadaf Conferance"da iştirak edib.

Fakültə tələbə elmi cəmiyyətinin konfranslarında fəal iştirakına, yüksək təhsil göstəricilərinə görə fəxri fərman və diplomlar alıb.

"Qrup yoldaşlarıma və bütün tələbələrə gələcək həyatlarında uğurlar arzulayıram. Tələbəlik illərini daha maraqlı yaşamalarını məsləhət görürəm. Bütün müəllimlərimə və ADPU bizə yaradılan şəraitə görə rəhbərliyinə təşəkkür edirəm."



**Babayev Yusif**

2003-cü ildə Bakı şəhərində anadan olub. 2021-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin Riyaziyyat fakültəsinə daxil olub. İctimai fəaliyyətinə ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsinin qrup meneceri kimi başlayan Yusif hazırda ADPU THİK-in Riyaziyyat fakültəsi üzrə sədri kimi fəaliyyətini davam etdirir.

"Bu gün "Universitet sənə nə qazandırdı?" sualı verilsə, çəkinmədən qısa müddətdə müəyyən auditoriya ilə peşəkarcasına çalışmaq və gözəl insanlarla tanış olaraq özümü inkişaf etdirmək şansı yaradıb deyərəm. Tələbələrə universitetə daxil olduqda dərslərlə yanaşı ictimai işlərlə də dərindən maraqlanmağı tövsiyə edirəm."



**Tağıyeva Səbinə**

İbtidai təhsil fakültəsinin III kursunda təhsil alır. Mübadilə proqramı ilə təhsilini bir semestrlik Danimarkada davam etdirir.

"Danimarkaya gəlmədən öncə ölkədə Regional İnkişaf İctimai Birliyi, "Bir" tələbə-könüllü proqramı təşkilatlarında könüllü və UNESCO klublarının AZUKA adlı layihəsində könüllü müəllim olaraq çalışmışam.

Uşaq vaxtımdan həmişə xəyalım ibtidai sinif müəllimi kimi çalışmaq olub. Universitetə daxil olduqdan sonra isə artıq özümü bu sahə üzrə harada və necə inkişaf etdirə bilərəm deyə düşünməyə başlamışdım. Bir çox seminarlara, layihələrə qoşulub orada məni inkişaf etdirəcək, mənim üçün yararlı olacaq bir çox informasiyaları araşdırırdım.Bu informasiyalardan daha biri III kurs başlamadan öncə qarşıma çıxan "Erasmus+ KA1" layihəsinin elanı oldu. Əminliklə deyə bilərəm ki bu elan mənim həyatımı,eləcə də düşüncələrimi dəyişdi. Danimarkaya gəldikdən sonra mən tək yaşamağı, büdcə idarə edilməsini və öz sahəm üzrə bir çox yeni faydalı məlumatları öyrəndim.

Gələcək tələbələrə və hal-hazırda tələbə olanlara demək istəyirəm ki, məqsədlərinizin və xəyallarınızın arxasınca gedin. İlk maneələrdən sonra ruh halınızı düşürməyin.Həmişə ən sonda sizi nə gözəllik gözləyir, ona fokuslanın və maneələrinizi bir-bir aşaraq o məqsədinizə çatın. Necə deyərlər: "Never give up!""



**Noroozi Hamed**

Məktəbəqədər təhsil fakültəsinin II kurs tələbəsidir. Hazırda Danimarkanın Kopenhagen şəhərində yerləşən UCC-də bir semestrlik mübadilə proqramındadır.

"Bu mübadilə böyük şansdır və təbii ki, bunu dəyərləndirmək də bizim payımızdır. Azərbacanda olduğum müddətdə fərqli müəssisələrdə çalışmışam və öz ixtisasımla bağlı daima yeniliklər gətirməyi bacarmışam. Burada olmağım, yığdığım təcrübələr və biliklər, habelə gəzdiyim digər ölkələrdən əldə etdiyim şeyləri tətbiq etmək niyyətindəyəm.

Hazırda Bakıda olmasam da "Ninja Kids Club"da baş müəllim kimi fəaliyyət göstərirəm. Nələr etmişəm və nələr edəcəyəm? Fərqli perspektivlərlə tanış oldum və pedaqoji prosesin müxtəlifliyini nəzərdən keçirdim. Burada isə saf-çürük edib akkomodasiya edib, bizə uyğun olanları ötürmək, tədqiq etmək və nəticədə də tətbiq etmək fikirindəyəm."



**Abbasov Elmir**

ADPU-nun sosial iş ixtisası üzrə IV kurs tələbəsidir. "Bu ilin yanvar ayından etibarən təhsilimi bir semestrlik Danimarkada davam etdirirəm.Burada təhsil və digər xərclərimi qarşılayan Erasmus proqramımdan müraciət şərtlərini ödəyən hər bir tələbə faydalana bilər. Fikrimcə təcrübənin həyatımızdakı vacib rolunu zamanında anlasaq, praktik addımlar ataraq bunun bizə geri dönüşünü təmin edə bilərik. Bu baxımdan özümü şanslı hiss edə bilərəm. Belə ki,birinci kursdan ABŞ Təhsilli Azərbaycan Məzunları, Kitabgəzər, eləcə də DOST mərkəzləri kimi müxtəlif sahələrdə həm təcrübəçi,həm könüllü kimi çalışmağım mənə davam etmək istədiyim sahəni müəyyənləşdirməyə kömək etdi.

Digər məsələ isə buradan qazandığım yumşaq və sərt bacarıqların önəmidir.Kopenhagendən geriyə baxarkən ünsiyyət,tənqidi təfəkkür, emosional zəka və tədqiqat kimi bu bacarıqların mənə indiki təhsilim üçün verdiyi imkanları müşahidə edə bilirəm.

Son olaraq tələbə yoldaşlara tövsiyyəm də məhz bu bacarıqlar üzərindən olacaq. Dünya İqtisadi Forumu mütəmadi olaraq gələcəyin iş dünyasında gərəkli bacarıqların siyahısını bölüşür, "Google"dan axtarış edərək onları tapa bilərsiniz.Müəllimim deyirdi ki, "Google" həzrətləri bizə çox şey verə bilər.Təki bunu necə soruşacağımızı bacaraq. Sağlıqla qalın.



Mürsəlov Hilal

1992-ci ildə Qobustan rayonunda anadan olub. 1999-cu ildə orta məktəbin birinci sinfinə gedib, 2007-2011-ci illərdə Şamaxı Humanitar Kollecinin ingilis dili müəllimliyi ixtisasında təhsil alıb. Hilal deyir ki, ali təhsil almaq ən böyük arzusu olduğu üçün, regionda yeganə ali təhsil müəssisəsi olan ADPU-nun Şamaxı filialının fəaliyyət göstərməsi məni çox sevindirirdi. 2017-ci ildə ADPU-nun Şamaxı filialının tarix və coğrafiya müəllimliyi ixtisasına qəbul oldunub. Elə həmin ildən filialın tələbə təşkilatlarına qatılıb və yüksək ictimai fəallığına görə Tələbə Gənclər Təşkilatının sədri seçilib. 2018-ci ildə kapitanı olduğu "İstiqlal" komandası ilə "Regionlar kuboku"nun qalibi olub. Həmin ildə filialın TGT-si ADPU TGT tərəfindən ictimai fəaliyyətə görə "İlin ən yaxşı TGT-si" seçilmişdir. TGT sədri olaraq fəaliyyəti ilə ölkədə gənclər siyasətinin təşkilinə verdiyi xüsusi töhfəyə görə ATGTİ tərəfindən fəxri fərmanla, Şamaxı rayon Gənclər və İdman idarəsi və eləcə də filialın rəhbərliyi tərəfindən dəfələrlə diplom və sertifikatlarla təltif olunub.

Təhsil aldığı müddətdə RİİB, YAP, ASAN könüllüləri, YAŞAT Fondu kimi təşkilatlarda könüllülük fəaliyyəti göstərib. Hazırda sonuncu (V) tədris ili tələbəsi olan Hilal Şamaxı Avropa liseyində pedaqoji təcrübə keçir. "Qazandığım bütün uğurlarımın arxasında öz biliklərini yüksək peşəkarlıqla biz tələbələrə aşılayan və vətənpərvər ruhlu gəncliyin yetişməsi üçün əzmlə çalışan filial kollektivi dayanır. Odur ki, mən müəllim olmaq istəyən abituriyentlərə ADPU-nun Şamaxı filialını seçmələrini tövsiyə edirəm. Əminliklə deyə bilərəm ki, filialı seçəcək tələbələr burada yüksək təhsil almaqla yanaşı, maraqlı tələbəlik həyatı da keçirəcəklər."




Nəsibli Güldəstə

2000-ci ildə Bərdə rayonunda anadan olub. 2006-2017-ci illərdə Gulgəzli kənd tam orta məktəbində təhsil alaraq oranı əla qiymətlərlə-fərqlənmə attestatı ilə bitirib. 2017-ci ildə ADPU-nun Şamaxı filialının riyaziyyat və informatika müəllimliyi ixtisasına qəbul olunub. Güldəstə deyir: "Filialda biz tələbələrin keyfiyyətli təhsil alıb, vətənpərvər və ziyalı şəxsiyyət kimi yetişməsi üçün yaradılan hər bir şəraitdən faydalanmışam. Professor-müəllim heyətinin müasir standartlara cavab verən texniki avadanlıqlarla təchiz olunmuş auditoriyalarda tədris etdiyi keyfiyyətli dərslər mənə öz peşəmi daha da sevdirib. 9 semestri əla qiymətlərlə başa vurmuşam. Dərsdən sonra filial, rayon və respublika əhəmiyyətli bir çox təlim, seminar, konfrans, intellektual oyunlarda və digər tədbirlərdə fəal iştirak etmişəm. Gənclər və İdman Nazirliyinin təşkilatçılığı ilə həyata keçirilən Explore layihəsində "EasyRest" adlı startapım ikinci yerə layiq görülüb.

Filialımızın Tələbə Elmi Cəmiyyətinin konfranslarında hər il müxtəlif mövzularda məqalələrlə çıxış edərək birinci və ikinci yerlərə layiq görülmüşəm. Azərbaycan Respublikası Gənclər Fondunun VIII qrant müsabiqəsində "Nəsimi yurdunda Nəsimi yaradıcılığı" adlı layihə ilə qalib olmuşam və layihəmin təqdimatını filialımızda həyata keçirmişəm. 2018-ci ildə ADPU-nun rektoru tərəfindən "İlin tələbəsi", 2019-cu ildə Təhsil Nazirliyi tərəfindən "Fəal könüllü" nominasiyaları üzrə diplomlarla təltif olunmuşam. Artıq filialı bitirməyimə bir neçə ay qalır. Çox xoşbəxtəm ki, uşaqlıqdan sevdiyim müəllimlik peşəsinə məhz ADPU-nun Şamaxı filialında yiyələnirəm. İnanıram ki, filialda aldığım təhsil gələcəkdə müəllim kimi fəaliyyətimdə mühümm rol oynayacaq. Filialı bitirdikdən sonra magistr və doktorantura təhsili alıb, bu peşənin sirlərini daha dərindən öyrənmək istəyirəm.

Gələcəkdə yüksək təhsil alıb, bacarıqlı müəllim kimi yetişmək istəyən hər bir abituriyent üçün ADPU-nun Şamaxı filialının uğurlu seçim olacağına əminəm."



İsmayılova Ayşənur

"Ömrümün ən gözəl illəri"

"Mən ADPU-nun Şəki filialında IV tədris ili tələbəsiyəm. Artıq təhsilimi başa vurmaq üzrəyəm. Doğma təhsil ocağından ayrılacağım üçün kədərlənsəm də, burada əldə etdiyim biliklər, qazandığım təcrübə məni müəllim kimi fəaliyyətə daha da həvəsləndirir. Sevinirəm ki, ali təhsil illərində dərslərimi yaxşı oxumaqla bərabər, TGT fəallarından olmuşam. Şair və yazıçıların yubileylərinə həsr olunmuş maraqlı tədbirlər, vətənimizin səfalı guşələrinə səyahətlər, bilik yarışları bütün tələbə yoldaşlarım kimi, mənim də yaddaşımda silinməz izlər buraxıb. Həmişə fəaliyyətimi yüksək səviyyədə qurmağa çalışmışam. 2020 və 2021-ci illərdə ardıcıl olaraq "İlin qrup nümayəndəsi" seçilmişəm. TGT-nin aktiv gənclərindən biri kimi əvvəlcə Layihə Departamentinin, daha sonra isə Debat Klubunun sədri kimi fəaliyyət göstərmişəm. "ADPU Şəki filialı 3-cü Daxili Debat Turniri"nin ən yaxşı IV natiqi, "Şimal-Qərb Gənclərinin Regional Debat Forumu: Payız 2018"in isə ən yaxşı I natiqi seçilmişəm. GencApp mobil tətbiqində keçirilən "Evrika" və "Sirlər xəzinəsi" yarışlarında Respublika üzrə III, "İntellektimizlə bayrağımızı ucaldaq!" layihəsində II, "İdeyanı reallaşdır" yarışında III, "Harop" turnirində II, "Birlikdə Öyrənək" regional intellektual yarışında II, Şəkidə keçirilən"Nizami Kuboku"nda komandamla birlikdə II, "Tarixin şifrəsi gənclərin axtarışında" və "Bayrakdar" intellektual yarışında III, Səbail rayonunda keçirilən "Xarıbülbül" intellektual yarışında III yerə çıxaraq universitetimin adını daim ucaltmışam. İctimai işlərdə fəallığıma görə ATGTİ tərəfindən dəfələrlə təltif olunmuşam. ASAN Könüllüləri Təşkilatının həyata keçirdiyi layihələrdə iştirak etmiş, intellektual oyunlarında komandamla bərabər respublika üzrə I yerə sahib olmuşam. ASAN Xidmətdə fevral- aprel aylarında "Master-1" könüllüsü proqramını birinci dərəcəli setifikatla başa vurmuşam. "Master-2" pilləsi üzrə könüllülü kimi 3 ay müddətində Vətəndaşların Hüquqi Təminatı sektorunda fəaliyyət göstərmişəm. Hazırda TGT-də sədr müavini olaraq fəaliyyətimi davam etdirirəm. Həm RİİB, həm də Bir könüllü təşkilatlarının üzvüyəm.

Qazandığım bütün bu uğurlar məni çox sevindirir. Sevinirəm ki, müəllimlərimizin çəkdiyi zəhmət və dörd illik tələbəlik həyatı hədər getməyib. Bir müəllim kimi yetişməklə bərabər, geniş dünyagörüşünə yiyələnmiş, təcrübə toplamışam. Bütün bunlara görə isə doğma universitetimə və əziz müəllimlərimə minnətdaram."



Səlimli Elcan

"Fəxr edirəm ki, bu ailənin üzvüyəm."

ADPU-nun Şəki filialının III tədris ili tələbəsidir.

"2019-cu ildə orta təhsili başa vurarkən məqsədim aydın idi: zaman-zaman heyranı olduğum doğma Azərbaycan dilinin gələcək tədqiqatçısı olmaq, bu dilin bütün incəliklərini öyrənmək, onu təbliğ etmək, həm də peşələrin tacı olan müəllimlik peşəsinə yiyələnmək. Dilimizə olan sevgim çox dərinlərdən gəlir. Ümummilli liderimiz Heydər Əliyevin televiziya ekranlarında möhtəşəm çıxışlarını hələ məktəb yaşlarından izlədikcə bu dahi şəxsiyyətin natiqlik məharətinə heyran olmaqla yanaşı, Azərbaycan dilinin nə qədər zəngin, musiqili, ahəngdar bir dil olduğunu görür, bu dilə daha çox bağlanırdım. Bu sevgi mənim respublika fənn olimpiadasında Azərbaycan dili üzrə qalib olmağıma, buraxılış və ali məktəbə qəbul imtahanlarında Azərbaycan dilindən 100% nəticə göstərməyimə vəsilə oldu. Mən bu imkandan istifadə edərək, bu sahə üzrə istənilən ali məktəbin uyğun ixtisasına müsabiqədənkənar qəbul olunmaq imkanı qazandım. Lakin ali məktəblərə qəbul imtahanında iştirak edərək özümü sınamaq istədim və 660.6 bal topladım.

Mənə elə gəlir ki, hər hansı bir dilin tədqiqatçısı olmaq üçün təkcə həmin dili yaxşı bilmək yetərli deyil. Bir neçə dili mükəmməl öyrənmək araşdırmalar və müqayisələr aparmaq üçün çox vacibdir. Bu gün dünyanın aparıcı dillərindən olan ingilis dilini öyrənmək məqsədilə bu ixtisas üzrə təhsil almaq qərarına gəldim. Təhsil illərində ingilis dilinə mükəmməl yiyələnmək, müstəqil şəkildə də ərəb dilini öyrənməyi qarşıma məqsəd qoydum.

Valideynlərimin də məzunu olduğu, ölkəmizə minlərlə peşəkar müəllimlər, tanınmış elm xadimlərii bəxş etmiş ADPU, məncə, alternativsiz bir ali təhsil ocağıdır. Doğma şəhərimdə – Şəkidə fəaliyyət göstərən bu qocaman universitetin filialı da mükəmməl təhsil məkanı kimi bu gün bölgədə xüsusi nüfuza malikdir. Bu təhsil ocağını və müəllimlik peşəsini seçərkən mənə etiraz edənlərə bir cavabım var idi: "Hüquqşünas da, hakim də, mühəndis də

ARDI 11-Cİ SƏHİFƏDƏ

müəllimdən öyrənir. Deməli, müəllim savadlı olanda hər sahədə uğur qazanmaq mümkün olur".

Qarşıma qoyduğum məqsədə doğru inamla addımlayıram. Bu yolda mənə doğma universitetim, sevimli müəllimlərim kömək edir. Filialda qaynar mühit, mehriban, qayğıkeş, eyni zamanda tələbkar, peşəsini sevən, təcrübəli müəllimlərimiz var, onların bilik və bacarıqlarından faydalanmaqla ixtisasıma yiyələnmək məni çox ruhlandırır. Qazandığım uğurlara görə müəllimlərimə borcluyam. Fəxr edirəm ki, ali təhsilimi məhz burada başlamışam. Nə yaxşı ki, elm, təhsil yollarında sizlərlə birgə addımlayıram."

P.S.: Elcan Səlimli həm də istedadlı və güclü tədqiqatçılıq qabiliyyəti olan gənclərdəndir. Ərəb dilini asan öyrənmək üçün vəsait hazırlamışdır. Üç hissədən ibarət vəsaitin I hissəsi artıq nəşr olunmuşdur.



Rəhimli Rəhman

"Uğurlu təhsilim üçün müəllimlərimə borcluyam." "Dörd ildir ki, ADPU-nun Şəki filialında təhsil alıram. Bu illər ərzində çox şey öyrəndim. Bacarıqlı, peşəkar, təcrübəli, yenilikləri öyrənən və bizə öyrədən dəyərli müəllimlərimdən seçdiyim "Xarici dil müəllimliyi - ingilis dili" ixtisasının sirlərinə yiyələndim. Sevinirəm ki, müəllimlərimin zəhmətini müəyyən qədər doğrultmuşam. IELTS imtahanında əldə etdiyim yüksək nəticə, ABŞ-da 3 aylıq təqaüd proqramını qazanmağım və ABŞ-nin ali təhsil müəssisələrində magistraturada təhsil almaq imkanı əldə etməyim məhz Şəki filialında aldığım yüksək təhsilin nəticəsidir. Mən də fürsətdən istifadə edib bizə yüksək səviyyədə təhsil alma imkanı yaradan dövlətimizə, universitetimizin və filialımızın rəhbərliyinə, professor-müəllim heyətinə sonsuz minnətdarlığımı bildirmək istəyir və demək istəyirəm ki, təhsil aldığım ali məktəbin adını gələcəkdə də fəaliyyətimlə həmişə ucaldacağam."



Şahmarova Sevda

2002-ci ildə Cəlilabad rayonunda anadan olmuşdur. 2019-cu ildə Cəlilabad şəhər 2 saylı tam orta məktəbini bitirərək ADPU-nun Cəlilabad filialının Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasına qəbul olunmuşdur. Sevda təhsil aldığı müddətdə ictimai fəallığı ilə fərqlənmişdir. O, filialda fəaliyyət göstərən THİK-in üzvü, TEC və TGT-də üzv və müavin kimi fəaliyyət göstərmişdir. Hazırda TGT-nin sədri vəzifəsini icra edir, eyni zamanda Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin könüllü işçi qrupuna da daxildir. RİİB, AKTİ, GKİM-in Cəlilabad nümayəndəliyində, Cəlilabad rayon Gənclər və İdman İdarəsində könüllü kimi fəaliyyət göstərir. O, filial və rayon rəhbərliyi, habelə digər təşkilatlar tərəfindən fəxri fərmanlarla təltif olunmuşdur. Sevda " Nizaminin izi ilə" və "Yaşıl zəhmət" adlı layihələrə rəhbərlik etmişdir.

"Filiala daxil olduğum ildən aktiv tələbə kimi yaddaşlarda qalmağı özümə hədəf seçdim. Dərslərimdə və filialın ictimai həyatında aktiv olmağa can atırdım və zaman keçdikcə nələrinsə öhdəsindən uğurla gəldiyimin fərqinə vardım.

Mən abituriyentlərə ADPU Cəlilabad filialını seçməyi məsləhət görərdim. Çünki oxumaq istədikləri ixtisas bu təhsil ocağında varsa, məkanın önəmi yoxdur. Onlar burada da yüksək fəaliyyət göstərə bilərlər. Filialın professor - müəllim heyəti həqiqətən qayğıkeş, mehriban və tələbə dostudurlar. Siz filialda müxtəlif təşkilatlara, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin könüllü işçi qrupuna üzv ola və ya onlarda müxtəlif vəzifələri icra edə, həm filial, həm də rayon tədbirlərində aktiv şəkildə iştirak edə bilərsiniz. Bununla yanaşı, digər gənclər təşkilatlarında da aktiv fəaliyyət göstərə bilərsiniz."



Mirzəyeva Günel

2000-ci ildə Cəlilabad rayonunda anadan olmuş, 2006-2017-ci illərdə doğulduğu Sərhədabad kənd tam orta məktəbində təhsil almışdır. 2018-ci ildə ADPU-nun Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasına daxil olmuşdur. Cəlilabad rayonunda yaşamasına görə ailəsi təhsilini universitetin Cəlilabad filialında eyni ixtisas üzrə davam etdirməsini istəmişdir.

O, təhsil aldığı müddətdə hər zaman akademik göstəricilərinin yüksək olması ilə digər tələbələrdən fərqlənib. Əlaçı təqaüdü alır. Yüksək göstəricilərinə görə filial rəhbərliyi tərəfindən fəxri fərmanla təltif edilmişdir.

Günel müəllimlik sənətinə qədəm qoyduğu ilk addımdan bu şərəfli peşəni sevərək layiqincə təmsil etməyə çalışır.

"Cəlilabad filialına transfer olunduğum xəbərini eşidəndə özümün də anlamadığım bir narahatlıq hissi keçirdim. Görəsən, necə bir təhsil ocağı, qrup yoldaşları, müəllimlərlə qarşılaşacam? Filialın direktoru ilə görüşdükdən və professor - müəllim heyəti ilə tanış olduqdan sonra məni narahat edən bütün sıxıntılara son qoyuldu. Ürəyimdə, "yaxşı ki, bu universitetə gəlmişəm" deyə fərəh hissi keçirdim. ADPU-nun Cəlilabad filialını sevməyimin əsas səbəbi bütün heyətin bizə öz gələcəkləri kimi baxmaları oldu. Onlar bizə elm öyrətməklə yanaşı, hər çətinliyimizdə yanımızda oldular. Qısası, bizim kiçik dünyamızın böyük qurucularından oldular. Filialın professor - müəllim heyəti tələbələrə eyni münasibət göstərirdilər. Biz tələbələrin bir-birimizdən fərqimiz yalnız imtahan sessiyasından sonrakı akademik göstəricilərimizdə olurdu. Bizdə "zəif və ya güclü" tələbə anlayışı olmadı. "Çox yaxşı və ən yaxşı tələbə" anlayışı oldu. Bizə sadəcə irəli və yenə irəli addımlamağı öyrətdilər. Onların sayələrində uzun bir yola çıxdıq. Uğurlu olması və qürurlanmağımız üçün əllərindən gələn heç bir şeyi əsirgəmədilər. Hər bir abuturiyentin bu cür universitet kollektivi ilə yola çıxmasını çox istərdim, çünki çıxdıqları yol yalnız irəliyə və uğura aparır. Və əmin ola bilərsiniz ki, bu filialda siz özünüzü ailənizdəki kimi hiss edəcəksiniz, çünki bu heyət sizə doğmalarınız qədər, onlardan da yaxın olacaqdır."



Şeydayeva Nazbikə

2000-ci ildə Quba rayonunda anadan olmuşdur. 2007-2018-ci illərdə doğulduğu Utuq kənd orta məktəbində təhsil almışdır. 2018-ci ildə ADPU-nun Quba filialının Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasına qəbul olunmuşdur. Əlaçıdır, 2021/2022-ci tədris ilinin birinci semestrində filial üzrə imtahan nəticələrinə əsasən ən yüksək ÜOMG toplayaraq Heydər Əliyev adına adlı təqaüdə layiq görülmüşdür.

Nazbikə universitetlə bağlı təəssüratlarını dilə gətirir: "ADPU-nun Quba filialını seçmək həyatımda qəbul etdiyim ən doğru qərarlardan biridir. Təhsil aldığım 4 il ərzində bu qərarın düzgünlüyünə tam əmin oldum. Bu universitetdə və sevdiyim ixtisasda təhsil almaq mənim üçün həm sevindirici, həm də qürurvericidir. Qazandığım biliyə, savada, dünyagörüşünə və həyat təcrübəsinə görə ADPU-nun Quba filialına minnətdaram."



**Nəcəfov Səyyad**

2000-ci ildə Quba rayonunda anadan olmuşdur. 2018-ci ildə ADPU-nun Quba filialının təhsildə sosial – psixoloji xidmət ixtisasına qəbul olunmuşdur. 2018-2019-cu illərdə filialda TGT-nin sədr müavini, 2020-ci ildən etibarən TGT sədri kimi uğurlu fəaliyyətə başlamışdır. O, magistr təhsili alaraq, ADPU-da öz ixtisası üzrə fəalliyyət göstərmək istəyir.

"ADPU-nun Quba filialı ən əsası yüksək və əlçatan təhsilin ünvanıdır, bu ali təhsil ocağı mənə yeni dostlar, həmçinin iş təcrübəsi qazandırıb. Burada rəhbərlik, kollektiv, professor-müəllim heyəti tələbələrə şəxsiyyət kimi yanaşır. İstər tədrisin keyfiyyəti, istərsə də gənclərin hərətərfli şəxsiyyət kimi yetişdirilməsi üçün həyata keçirilən layihələrin, tədbirlərin keyfiyyət və kəmiyyəti biz tələbələr qarşısında uğurlu gələcək üçün yol açır. "

Səyyad dəfələrlə ümumrayon tədbirlərində, intellektual oyunlarda, yarışlarda birincilik əldə edib.

O cümlədən Quba GİKM və Yurd Gənclərin İntellektual İnkişafına Dəstək İB təşkilatçılığı ilə keçirilən "Quba Yay Liqası"nda III, ADPU TGT-nin keçirdiyi Vətən müharibəsinə həsr olunmuş "Xarıbülbül intellektual turniri"ndə I, Aprel döyüşlərinin ildönümünə həsr olunmuş tələbələr arasında "Qayıdış" Xəmsə Milli İntellektual oyunu üzrə kubokda I yer tutmuşdur.

YAP-nın yaradılmasının 27-ci ildönümü və partiya işindəki fəaliyyətinə görə YAP Quba Rayon təşkilatı tərəfindən Fəxri Fərmanla, 2020-ci ildə ADPU-nun Quba filialında "İlin tələbəsi" diplomuyla, Quba rayon Gənclər və İdman İdarəsi tərəfindən "İlin fəal gənci" nominasiyası ilə təltif olunub.



**Mamedova Aytac**

"2021/2022-ci tədris ilində ADPU-nun Ağcabədi filialının "Xarici dil müəllimliyi" (ingilis dili üzrə) ixtisasına qəbul olunmuşam. Bu universiteti və ixtisası seçdiyim üçün çox şanslıyam. Burada peşəkar müəllimlər yeni təlim metodlarından istifadə edərək yüksək səviyyədə dərslər keçməklə yanaşı, bizdən metodiki yardım və qayğılarını da əsirgəmirlər. Orta məktəbi əla qiymətlərlə bitirmişəm. Hazırda universitetdə də təhsilimi yüksək nəticələrlə davam etdirirəm və əlaçı təqaüdünü qazanmışam. Digər universitetlərdə eyni ixtisasda təhsil alan tanışlarımdan onlarda tədrisin necə təşkil olunması ilə maraqlanıram və bizdə tədrisin daha üstün olmasına çox sevinirəm. Rəhbərliyin daim bizimlə maraqlanmasını və bizə əlavə təlimlər təşkil etməsini çox yüksək qiymətləndirirəm. Hər bir abituriyentə bu universiteti və ixtisası seçmələrini tövsiyə edərdim."



**Əliyeva Nuray**

ADPU-nun Ağcabədi filialının "Təhsildə sosial-psixoloji xidmət" ixtisası üzrə II tədris ilinin tələbəsidir.

"Düzdür bu ixtisasa könülsüz qəbul olsam da, sonradan bu peşəni sevməyimdə fənn müəllimlərimin xüsusi rolunu qeyd etməliyəm. İxtisasımı öyrəndikcə dövrümüz üçün nə qədər vacib və zəruri peşə olduğunu anladım. Direktorumuz bizimlə mütəmadi şəkildə keçirdiyi görüşlərdə hər zaman qeyd edir ki, əsas məqsədimiz savadlı mütəxəssislər yetişdirmək və cəmiyyətimizə öz töhfələrini verə biləcək, gənc nəslin təlim-tərbiyəsində əhəmiyyətli rol oynayacaq psixoloqlar hazırlamaqdır.

Dərslərimiz peşəkar müəllimlər sayəsində yüksək səviyyədə keçirilir. Tədrisin keyfiyyətinin yüksəldilməsi, öyrənmə prosesinin daha maraqlı olması və psixoloji cəhətdən bizi hazırlamaq üçün hər həftənin bir günü dərsdənkənar film izləmə saatları təşkil edilir. Filialın direktorunun həmin filmləri bizimlə birlikdə izləməsi və müzakirələrdə iştirakı biz tələbələrin peşəmizə olan marağını daha da artırır.

Hazırda təhsilimi yüksək səviyyədə davam etdirir və əlaçı təqaüdü alıram.

Təhsil aldığım ADPU-nun Ağcabədi filialını və sevimli ixtisasımı seçməyi abituriyentlərə, gələcəyin tələbələrinə tövsiyə edirəm."



**Əliyeva Nurçin**

ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində məktəbəqədər təlim və tərbiyə ixtisası üzrə təhsil alır. III kurs tələbəsidir. "Mənim ADPK-da təhsil almağımın başlıca səbəbi anamdır. Anamın gənclik xəyallarından biri övladının burada təhsil almasıymış. Buraya qəbul olunanda düşünürdüm ki, bu kollec mənim oxuya biləcəyim yer deyil. Hər zaman məşhur universitetlərlə müqayisə edirdim. Amma ADPK-da oxumağa başladıqdan sonra nə qədər yanıldığımı gördüm. ADPK-nın təhsilinin bir çox universitetlərin təhsilindən yüksək olduğunun şahidi oldum. İndi sözün əsl mənasında fəxr edirəm ki, burada təhsil alıram. ADPK 3 ildə həyatımın bir çox hissəsinə toxundu. Ailəm qədər sevdiyim rəfiqələrimi, ömrümün sonuna qədər nəsihətlərini unutmayacağım dəyərli müəllimlərimi qazandırdı. Tək bu da deyil. Bura mənə gələcəkdə savadlı müəllim olmağım üçün ən gözəl şəraiti yaratdı. Kollecimiznin rəhbərliyini və bütün müəllimlərimə təşəkkürümü bildirirəm!

Təbii ki, təhsilim burada bitməyəcək. Gələcəkdə ADPU-da təhsilimi davam etməyi düşünürəm."



**Şahbazlı Sübhan**

ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin texnologiya müəllimliyi ixtisasının IV kurs tələbəsidir. "Kollec mənə 4 il müddətində müəllimliyin dərin sirlərini öyrətdi, hər semestr mehriban, savadlı müəllimlər bəxş etdi. 4 il ərzində mən pedaqoji bacarıqları və prinsipləri öyrəndim. Burada öyrəndiklərimi öz fəaliyyətim dövründə də tətbiq edəcəyəm.

Kollecimizi seçəcək abituriyentlərə tövsiyəm budur ki, gələcəyin savadlı kadrı olmaq istəyirsinizsə yolunuz ADPK olsun."

# MÜHÜM YENİLİKLƏR

## PEDAQOJİ UNİVERSİTETDƏ PISA DİREKTORU ANDREAS ŞLEYXERİN USTAD DƏRSİ VƏ KİTAB TƏQDİMATI KEÇİRİLİB




Aprelin 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatının (İƏİT) Təhsil və bacarıqlar üzrə direktoru, eləcə də PISA (Şagird nailiyyətlərinin beynəlxalq qiymətləndirilməsi Proqramı) rəhbəri Andreas Şleyxerin "Dünya standartları: XXI əsrin məktəbini necə qurmalı" kitabının təqdimatı keçirilib. Kitab Təhsil Nazirliyinin dəstəyi ilə "T-Network" təhsil işçilərinin təcrübə və kommunikasiya platforması tərəfindən Azərbaycan dilində çap edilib. Kitabda PISA tədqiqatlarına əsasən dünyanın müxtəlif ölkələrinin təhsil sistemlərinin müqayisəsi əsasında XXI əsrdə keyfiyyətli təhsil vermənin vasitələri araşdırılıb.

Təqdimatda təhsil naziri Emin Əmrullayev, PISA direktoru Andreas Şleyxer, millət vəkilləri, Təhsil nazirliyi və tabe qurumların rəsmi şəxsləri, nazirlik yanında İctimai Şuranın üzvləri, ali məktəb rektorları, təhsil ekspertləri, məktəb direktorları, müəllimlər, tanınmış elm xadimləri, QHT və KİV təmsilçiləri, beynəlxalq təşkilatların əməkdaşları iştirak edib.

"T-Network" rəhbəri Cəfər Mənsimi tədbir iştirakçılarını salamlayaraq bildirib ki, platforma tərəfindən yeni çağırışlar devizi ilə indiyədək bir çox dünya şöhrətli təhsil və ictimai xadimlərlə Azərbaycan ictimaiyyətinin onlayn görüşləri təşkil edilib. Bu gün isə cənab A.Şleyxeri ADPU-da qonaq etməkdən böyük fəxr hissi keçiririk. Müəllif öz kitabında hər uşağın öyrənmə potensialına inanaraq mümkün olmayan üçün çalışmaq yox, mümkün olanı əldə etməyə səy göstərməyi öyrədir. Çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov bildirib ki, Azərbaycan 2006-cı ildən etibarən PISA beynəlxalq qiymətləndirməsində iştirak etməyə başlayıb. Bu tip tədqiqatlar, o cümlədən belə kitablar təhsil sistemimizdə müsbət dəyişikliklərə əsas yaradır. Bu günün və gələcəyin təhsili insanların xoşbəxtliyi və səriştələrə yiyələnmələri əsasında qurulmalıdır.

Rektor qeyd edib ki, özünün Milli prioritetlərində, habelə müəllim hazırlığında innovativ yanaşmalar tətbiq edən Azərbaycan üçün keyfiyyətli təhsilverənlər yetişdirmək yolunda davamlı tədbirlər icra edən ADPU-da da beynəlxalq təcrübə öyrənilir və tətbiq edilir. Universitetin Strateji İnkişaf Mərkəzi PISA, PİRLS, TALİS kimi beynəlxalq qiymətləndirmə tədqiqatlarında iştirak edir. Məqsəd öyrənməyi öyrədən təhsil kadrlarını yetişdirməkdir. Heç bir təhsil sistemi onun kadrlarının səriştələrindən mükəmməl ola bilməz.



C.Cəfərov vurğulayıb ki, bu baxımdan dünyanın ən öndəgələn təhsil tədqiqatçılarından olan cənab A.Şleyxerin sözügedən kitabı təhsil ictimaiyyətinin masaüstü kitabı olmalı, dərs vəsaiti kimi tədris edilməlidir. Təhsil naziri Emin Əmrullayev çıxış edərək A.Şleyxerin tədqiqat əsərinin dünyada təhsilə dair ən yaxşı kitablardan biri kimi xüsusi əhəmiyyət kəsb etdiyini və onun dilimizə tərcüməsini yüksək qiymətləndirdiyini qeyd edib. Nazir bildirib ki, Azərbaycanın 2006-cı ildən başladığı beynəlxalq qiymətləndirmələrdə iştirakı 2016-cı ildən etibarən yeni səviyyədə davam etdirilir. Bu gün Azərbaycan bütün beynəlxalq qiymətləndirmələrdə iştirak edir. Cəmiyyət olaraq nəzərə almalıyıq ki, PISA və onun kimi digər beynəlxalq qiymətləndirmələr heç də yarış deyil, kifayət qədər, dünyada ən çox elmtutumlu bir tədqiqatdır. Onun yekununda ölkələrin keyfiyyət indikatorları əsasında sıralama aparılır. Burada əsas olan hər hansı ölkənin təhsil sistemini şəkilləndirən intikatorların təhlilidir. Məsələyə səthi yanaşma ilə deyil, təhlil əsasında yanaşıb müsbət dinamikaya səbəb olacaq real qərarlar vermək olar. E.Əmrullayev vurğulayıb ki, milli qiymətləndirməmizdə də beynəlxalq qiymətləndirmə standartlarının tələbləri nəzərə alınır. PISA-da iştirakın özü artıq müəyyən bir nəticə deməkdir. Azərbaycan təhsil sistemi üçün bu yarış yox, düzgün qərarlar, dövlət siyasətinə dəstək verən faydalı bir alətdir.




Təqdimat çərçivəsində kitabın müəllifi Andreas Şleyxer "Dünya standartları: XXI əsrin məktəbini necə qurmalı" mövzusunda ustad dərsi verib.

Cənab Şleyxer çıxışında Azərbaycanın zəngin mədəni və elmi potensialının heyranlıq doğurduğuna diqqət çəkərək daha yaxşı nəticələrə nail olmaq üçün müəllimlərin səriştələrinin artırılması üzərində çalışmağın vacibliyini vurğulayıb.

Tədqiqatçı bildirib ki, PISA bir güzgüdür. Onun vasitəsilə mövcud vəziyyəti təhlil edib, qabaqcıl təcrübələrlə müqayisələr aparıb lazım olanı görə bilərik. Bugünkü məktəb gələcəyin iqtisadiyyatıdır. Ona görə də bu məsələlər çox vacibdir. Fundamental olaraq savad anlayışı dəyişilir. Əvvəl bir suala sabit cavab var idi, bu gün minlərlə. Deməli, faktlarla rəyi ayırmağı bacaran, informasiya bolluğunda təhlil apara bilən, mahiyyəti anlayacaq zəkalar tərbiyə etməliyik.




A.Şleyxer vurğulayıb ki, araşdırmalar məktəblərin nailiyyətinin nələrdən asılı olması məsələsində bildiyimiz bir çox stereotiplərin əksini göstərir. Maliyyə və yoxsulluq heç də aqibət deyil. Bir çox dünya ölkələrinin təcrübəsinin təhlili göstərir ki, əsas xərclər deyil, mövcud resursların yerləşdirilməsi, onlardan necə istifadə etməkdir. Ən qabaqcıl təhsil sistemlərindən götürəcəyimiz əsas şeylər müəllimə verilən dəyər, peşənin nüfuzu, hər tələbənin uğuruna istisnasız inanmaq və fərdi yanaşma, hər bir uşaqdan yüksək nəticə gözləmək,məzmuna deyil, konsepsiyalara, izaha geniş yer vermək, idraki tələb qoymaq, qiymətləndirmələrdə tətbiq bacarıqlarını ölçmək peşə müstəqilliyi, şagirdini tanımaq, onun öyrənmə üsulunu bilmək, əməkdaşlıq mədəniyyəti, stimulların uyğunlaşdırılması, müəllimlərin yeniliklərini sistemin və valideynin tanıması və liderlik, məsuliyyət kimi amillərdir. Bütün bunları nəzərə alaraq dəyişiklik üçün kiçik yaşlılardan başlamaq daha effektiv nəticələrə gətirər. Sonda cənab Şleyxer sualları cavablandırıb və iştirakçılara kitab hədiyyə olunub.

# ADPU-NUN ŞƏKİ FİLİALI ELM VƏ TƏHSİLİN İNKİŞAFINDA BÖYÜK XİDMƏTLƏR GÖSTƏRİB





Martın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialının 30 illik yubileyinə həsr edilmiş təntənəli bayram tədbiri keçirilib. Şəki şəhər Heydər Əliyev Mərkəzində təşkil olunan tədbirdə Şəki Şəhər İcra Hakimiyyətinin başçısı Elxan Usubov, ADPU-nun rektoru Cəfər Cəfərov, Milli Məclisin deputatı Əli Məsimli, elm adamları, ziyalılar, filialın əməkdaşları, tələbələr, ictimaiyyət nümayəndələri iştirak ediblər.

Şəhər rəhbərliyi və tədbirə dəvət olunan qonaqlar əvvəlcə ümummilli lider Heydər Əliyevin Mərkəzin qarşısında ucaldılan abidəsi önünə gül dəstələri düzüb, dahi rəhbərin xatirəsini ehtiramla anıblar.

Sonra tədbir iştirakçıları Mərkəzin foyesində ADPU-nun Şəki filialının 30 illik fəaliyyətini əks etdirən sərgi ilə tanış olublar.

Yubiley tədbirinin əvvəlində Azərbaycanın Dövlət himni səsləndirilib, Vətənimizin azadlığı, suverenliyi və ərazi bütövlüyü uğrunda şəhid olan həmvətənlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun Şəki filialının fəaliyyətindən bəhs edən film nümayiş olunub.

Tədbirdə Şəki Şəhər İcra Hakimiyyətinin başçısı Elxan Usubov çıxış edərək, gözəl təbiəti, tarix və mədəniyyət abidələri ilə tanınan Şəkinin həm də, Azərbaycanın qədim sənət, elm və təhsil mərkəzlərindən biri olduğunu bildirib. Qeyd olunub ki, son illər Şəkidə iqtisadiyyatın bir çox sahələrinin inkişafına nail olunub, yeni infrastruktur layihələri icra edilib, abadlıq-quruculuq işləri həyata keçirilib. Bu illər şəhərin mədəni həyatında baş verən mühüm hadisələrlə də zəngin olub. Belə ki, Şəki şəhəri 2010-cu ildə "Azərbaycanın Sənətkarlıq Paytaxtı" seçilib, 2012-ci ildə "Türk dünyasının qeyri-maddi mədəni irs paytaxtı", 2016-cı il üçün "Türk dünyasının mədəniyyət paytaxtı" elan olunub, 2017-ci ildə isə UNESCO-nun Yaradıcı Şəhərlər Şəbəkəsinə daxil edilib. 2019-cu ildə Azərbaycanın, eləcə də Şəki şəhərinin həyatında çox əlamətdar hadisə baş verib – "Xan Sarayı ilə birgə Şəkinin tarixi mərkəzi" UNESCO-nun Ümumdünya İrs Siyahısına əlavə olunub.

Diqqətə çatdırılıb ki, qədim tarixi olan Şəkidə elmə, təhsilə həmişə böyük maraq olub. Bu şəhər Azərbaycan təhsilinin, elminin, pedaqoji fikir tarixinin formalaşmasında yaxından iştirak edib. XIX əsrin 30-cu illərində Zaqafqaziyada ilk qəza məktəblərindən biri məhz Şəkidə fəaliyyətə başlayıb. Bildirilib ki, Şəki, həmçinin Azərbaycan və dünya elminə, ədəbiyyatına, təhsilinə böyük töhfələr vermiş görkəmli insanların vətənidir. Mirzə Fətəli Axundzadə, Rəşid bəy Əfəndiyev, Salman Mümtaz, Əbdüləzəl Dəmirçizadə, Bəxtiyar Vahabzadə və başqaları Şəki torpağının yetirmələridirlər.

Qeyd edilib ki, ölkənin, cəmiyyətin inkişafı bu və ya digər dərəcədə elm və təhsilin inkişafı ilə bağlıdır. Azərbaycan Dövlət Pedaqoji Universitetinin yaranması xalqımızın milli fikir və mədəniyyətinin formalaşmasında, inkişaf etməsində mühüm rol oynayıb. Yubileyi qeyd olunan ADPU-nun Şəki filialı Şəki-Zaqatala iqtisadi zonasında elm və təhsilin inkişafında böyük xidmətlər göstərib, etimada layiq elmi-struktur kimi özünü təsdiqləyə bilib. Ötən dövr ərzində filialda ayrı-ayrı ixtisaslar üzrə 5 mindən çox yüksəkixtisaslı pedaqoji kadr hazırlanıb. Onlar ölkəmizin müxtəlif elm, təhsil müəssisələrində, mühüm dövlət qurumlarında fəaliyyət göstərir, dövlətçiliyimizin möhkəmləndirilməsi, təhsilimizin inkişafı naminə səylə çalışırlar. Sonra Şəki Şəhər İcra Hakimiyyətinin başçısı Elxan Usubov Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru Cəfər Cəfərova və universitetin Şəki filialının direktoru Rafiq Rəsulova xatirə hədiyyələri təqdim edib.

ADPU Şəki filialının bir qrup əməkdaşı şəhər icra hakimiyyəti başçısının müvafiq sərəncamı ilə fəxri fərmanla təltif olunub.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərov çıxış edərək, filialın əməkdaşlarını əlamətdar yubiley münasibətilə təbrik edib. Diqqətə çatdırılıb ki, 2021-ci ildə ölkəmizdə pedaqoji kadrlar hazırlayan ilk ali təhsil müəssisəsinin - Azərbaycan Dövlət Pedaqoji Universitetinin yaradılmasının 100, bu təhsil ocağının Şəki, Şamaxı və Quba filiallarının isə 30 ili tamam olub. Bütöv bir əsr ərzində böyük inkişaf yolu keçmiş, bu gün ölkəmizdə ali pedaqoji təhsilin bayraqdarı hesab edilən universitet pedaqoji elmin beşiyi rolunu oynayıb, digər elmlərin, xüsusilə də dilçilik və riyaziyyatın inkişafında müstəsna xidmətlər göstərib. 100 il ərzində ADPU 160 mindən çox ixtisaslı müəllim kadrları yetişdirib, görkəmli alimlər ərsəyə gətirib, fəaliyyəti ərzində, həm də elmi mərkəz kimi formalaşaraq inkişaf edib. Burada yüzlərlə tanınmış alim, yaradıcı ziyalı, ictimai və dövlət xadimi təhsil alıb. Qeyd olunub ki, hazırda universitet pedaqoji kadr hazırlığı ilə məşğul olan vahid ixtisaslaşmış ali təhsil müəssisəsinə çevrilib. ADPU-da hər il 4 mindən çox məzun öz təhsilini başa vurur. Ölkənin 5 rayonunda universitetin filialları, Bakıda 4 tədris korpusu, 1 kolleci və 1 baza məktəbi fəaliyyət göstərir.

Tədbirdə ADPU-nin Şəki filialının direktoru, riyaziyyat üzrə elmlər doktoru, dosent Rafiq Rəsulov çıxış edərək, filialın 30 illik fəaliyyəti barədə geniş məlumat verib. Bildirilib ki, 30 yaşlı bu təhsil ocağının tarixində 2015-ci ildən sonra xüsusi mərhələ başlayıb. Prezident İlham Əliyevin 2015-ci il 26 noyabr tarixli Sərəncamına əsasən, Azərbaycan Müəllimlər İnstitutu Azərbaycan Dövlət Pedaqoji Universitetinin tərkibinə daxil olub, filialları isə ADPU-nun filialları hesab edilib. Regionda mövcud olan bir filialın 100 yaşlı qocaman ali təhsil müəssisəsinin tabeliyində fəaliyyət göstərməsi bu elm ocağının qazandığı zəngin təcrübədən bəhrələnmək üçün geniş imkanlar açıb. Diqqətə çatdırılıb ki, 30 il ərzində filialda 5 mindən çox ali təhsilli pedaqoji kadr hazırlanıb, 6 mindən çox müəllimin ixtisasının artırılması və təkmilləşdirilməsi həyata keçirilib. Hazırda filialda 2 fakültədə 9 ixtisas üzrə 900-dən çox tələbə təhsil alır. Filialın 86 əməkdaşından 3 nəfəri elmlər doktoru, 15 nəfər isə fəlsəfə doktorudur.

Filialın tələbələrinin təbrik və çıxışlarından sonra yubiley tədbiri bədii proqramla başa çatıb

# ADPU-DA KEYFİYYƏT TƏMİNATI VƏ TƏLƏBƏLƏRLƏ İŞ SAHƏSİNDƏ YENİ YANAŞMALAR TƏTBİQ EDİLİR





Mart ayının 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının növbəti iclası keçirilib.

Açılış nitqi ilə çıxış edən Universitetin rektoru professor Cəfər Cəfərov kollektivi qarşıdan gələn Novruz bayramı münasibətilə təbrik edib və ötən dövr ərzində bir nəfər professor, beş nəfər isə dosent elmi adı alan əməkdaşlara diplomlarını təqdim edib.

ADPU-nun Keyfiyyətin təminatı şöbəsinin müdiri dosent Qalib Şərifov 2020-2021-ci tədris ilində ADPU-nun professor-müəllim heyətinin reytinq qiymətləndirilməsinin yekunları haqqında məruzə edib. Diqqətə çatdırılıb ki, artıq 4 ildir Pedaqoji Universitetdə əməkdaşların reytinq qiymətləndirilməsi həyata keçirilir və bu sahədəki fəaliyyətin təkmilləşdirilməsi üzərində davamlı iş aparılır. Son qiymətləndirmənin nəticələrinə görə müxtəlif fakültə və kafedraların əməkdaşları olan 160 nəfər professor-müəllimin mükafatlandırılması nəzərdə tutulur. Qeyd edək ki, reytinq qiymətləndirilməsində əməkdaşların elmi-tədqiqat fəaliyyəti, tələbə məmnunluğu və sosial aktivlik üzrə parametrlər nəzərə alınır.

Daha sonra ADPU-nun Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri Turan Kərimli şöbənin 2021-ci ildəki fəaliyyəti haqqında hesabatla çıxış edib. Natiq diqqətə çatdırıb ki, hesabat dövründə şöbə tərəfindən universitetin ictimaiyyətlə və tələbələrlə əlaqələrini təkmilləşdirmək istiqamətində yeni mexanizmlər tətbiq olunub, Universitetin qəzetinin yeni tərtibatda nəşrinə başlanılıb, ADPU-nun 100 illik yubileyi ilə bağlı kitablar və çap məhsullarının hazırlanması, təşkilati məsələlər yüksək səviyyədə yerinə yetirilib. O cümlədən ötən bir il ərzində ADPU-nun tələbə təşkilatlarının fəaliyyətini də diqqətəlayiq hesab etmək olar. Qeyd olunmalıdır ki, ADPU TGT bu il artıq üçüncü dəfə ardıcıl olaraq "İlin TGT-si" seçilib.

Məruzələr ətrafında çıxış edənlər şöbələrin fəaliyyətini yüksək qiymətləndiriblər.

İclas cari məsələlərin müzakirəsi ilə davam edib. Sonda rektor C.Cəfərov yekun nitqi söyləyərək qarşıda duran vəzifələrlə bağlı tövsiyələrini verib.

# TƏLƏBƏLƏRİMİZİN FƏALİYYƏTİ

## ÜÇQAT DÜNYA VƏ AVROPA ÇEMPİONU HACI ƏLİYEV TƏLƏBƏLƏRİN QONAĞI OLUB





Martın 11-də Azərbaycan Dövlət Pedaqoji Universiteti Tələbə Gənclər Təşkilatı (ADPU TGT) nəzdində İdman və sağlamlıq klubu və İbtidai təhsil fakültəsi təşkilatının təşkilatçılığı ilə "Çempionun uğur yolu" adlı görüş keçirilib. Görüşün qonağı ölkənin tanınmış idmançısı, 3 qat Dünya və Avropa çempionu, Olimpiya oyunlarının bürünc və gümüş medalçısı Hacı Əliyev olub.

Əvvəlcə ADPU-nun rektoru Cəfər Cəfərov Hacı Əliyevi qəbul edərək Azərbaycan idmanına verdiyi töhfələrə görə təşəkkür edib, öz növbəsində idmançı da dövlətin və xalqın mənəvi dəstəyini daim arxasında hiss etdiyini vurğulayıb. Görüşdə Universitetin sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev Azərbaycanda idmana dövlət qayğısının təməlinin möhkəm sütunlara əsaslandığını, aparılan sistemli işlər nəticəsində dünya miqyasında uğurların əldə olunduğunu bildirib. Hacı Əliyev karyerası ərzində əldə etdiyi nailiyyətlərdən söz açaraq qət etdiyi bu yolun nə qədər çətin olsa da, qürurverici olduğunu qeyd edib.

Qarşıda onu gözləyən "Paris 2024" Olimpiya oyunlarında qızıl medalı hədəfləyən Əliyev xalqın dəstəyi ilə bu missiyanın öhdəsindən layiqincə gələcəyinə inandığını ifadə edib.

## TƏLƏBƏLƏR DAUN SİNDROMLU UŞAQLARI ZİYARƏT EDİB



Martın 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin "ADPU Könüllüləri" Tələbə Birliyi nəzdində fəaliyyət göstərən Kitab klubunun üzvləri daun sindromlu uşaqlara baş çəkiblər. "21 mart - Beynəlxalq Daun Sindromu Günü" nü "Günəşin övladları" ilə birgə keçirmək, həmçinin onların sevgi dolu qəlbini yaxından tanımaq məqsədi ilə təşkil olunan ziyarətdə tələbələr bir- birindən istedadlı daun sindromlu dostlarımızla tanış olaraq onlarla əyləncəli vaxt keçiriblər. Tələbələr daun sindromlu uşaqların əl işləri ilə də tanış olublar.

Qeyd edək ki, daun sindromlu şəxslərə diqqəti cəlb etmək, onların sosiallaşmasına dəstək göstərmək məqsədilə hər il mart ayının 21-i "Beynəlxalq Daun Sindromu Günü" kimi qeyd edilir. Bu gün bu sevgi dolu şəxslərin timsalında "Sevgi xromosom tanımır!" şüarı bir daha bütün dünyaya çatdırılır.

## TƏLƏBƏ TƏŞKİLATLARI BAKI TÜRK ŞƏHİDLİYİ ABİDƏSİNİ ZİYARƏT EDİB

Martın 31-də ADPU TGT-nin təşkilatçılığı, ADPU Könüllüləri Tələbə Birliyi və ADPU Türk Öyrənci Yönetim Konseyinin iştirakı ilə 31 mart soyqırımının 104-cü ildönümünə həsr olunmuş yürüş keçirilib. Yürüş çərçivəsində tələbə təşkilatlarının nümayəndələri Bakı Türk şəhidliyini və Şəhidlər Xiyabanını ziyarət ediblər. ADPU TGT sədri İsmayıl Nəsirov 1918-ci ilin mart soyqırımlarını öz amansızlığına və miqyasına görə təkcə Azərbaycan tarixində deyil, bəşər tarixində də ən qanlı faciələrdən biri kimi dəyərləndirib.



## ADPU TGT XƏMSƏ MİLLİ İNTELLEKTUAL OYUNU ÜZRƏ "QAYIDIŞ" KUBOKU KEÇİRİB

Aprelin 2-də Sabunçu Gənclər Evində ADPU TGT-nin təşkilatçılığı, Bakı şəhər Gənclər və İdman Baş İdarəsinin (BŞGİBİ), Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ), Sabunçu Gənclər Evinin və Consensus İntellektual Mərkəzinin dəstəyi ilə Aprel döyüşlərinin altıncı ildönümünə həsr olunmuş Xəmsə Milli İntellektual Oyunu üzrə "Qayıdış" kuboku təşkil olunub.

Rəsmi açılış mərasimində çıxış edən BŞGİBİ-nin baş məsləhətçisi Samir Kazımov bu tip oyunların tələbələrin şəxsi intellektual inkişafı üçün böyük əhəmiyyət kəsb etdiyini qeyd edib.





ADPU-nun Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri Turan Kərimli ADPU-da vaxtilə formalaşan intellektual hərəkatın xüsusilə bölgələrdə yerləşən filiallara da nüfuz etməsinin mühüm bir məqam olduğunu bildirmiş və bu qəbildən olan yarışların mütəmadi həyata keçirilməsinin zəruriliyini diqqətə çatdırmışdır. Çıxış edən ATGTİ-nin baş katibi Orduxan Qəhrəmanzadə İttifaq tərəfindən TGT-lərin bu kimi intellektual istiqamətdə olan bütün fəaliyyətlərinin yüksək qiymətləndirildiyini vurğulamış və ölkəmizdə davam etdirilən uğurlu dövlət gənclər siyasətindən bəhs etmişdir.

Beşi ADPU-nun filiallarını, ikisi isə Pedaqoji Kolleci təmsil edən ümumilikdə 15 komandanın iştirakı ilə baş tutan Xəmsə milli intellektual oyunu üzrə "Qayıdış" kubokunun yekununda ADPU-nun Quba filialını təmsil edən "Assassin's Creed" komandası birinci, Bakını təmsil edən "ProMath" komandası ikinci, ADPU-nun Şəki filialını təmsil edən "Fearless" komandası isə üçüncü yeri tutmuşdur. Eyni zamanda oyun ərzində ən çox suala düzgün cavab verərək xüsusilə fərqlənən iki tələbə, Elxan Əskərov və Bikəxanım Qulaməddinova da diplomla təltif olunmuşlar.

## ADPU-NUN ƏMƏKDAŞLARI DANİMARKADA BEYNƏLXALQ HƏFTƏDƏ İŞTİRAK EDİB

ADPU-nun beş nəfər əməkdaşı Danimarkada keçirilən Beynəlxalq həftədə iştirak edib. Görüşlərdə gender bərabərliyi və onun əhəmiyyəti, beynəlxalq əməkdaşlıq kimi bir çox aktual mövzular müzakirə edilib.

Səfərin birinci günü Monaş Universiteti (Avstraliya), Kopenhagen Universitet Kolleci (Danimarka), Malmö Universiteti (İsveç) nümayəndələrinin, ikinci günü Frankfurt Tətbiqi Elmlər Universiteti (Almaniya), Kopenhagen Universitet Kolleci, Tətbiqi Sosial Elmlər Katolik Universiteti (Almaniya), Vinneba Təhsil Universiteti (Qana) nümayəndələrinin təqdimatları dinlənilib. Üçüncü gün tərəfdaş universitetlərin nümayəndələri və əcnəbi tələbələri ilə görüş keçirilib. Görüşdə tərəflərin təklifləri və iradları dinlənilib. Dördüncü və beşinci gün dekan müavini Könül Həsənova, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və Xarici Dillər Mərkəzinin əməkdaşları Ülviyyə Hacıyeva və Mirvari Qasımova Kopenhagendə yerləşən baxça və məktəbləri ziyarət edib, orta məktəb dərslərinin strukturu ilə yaxından tanış olublar. Tarix və coğrafiya fakültəsinin müəllimi Səmayə Həsənova sözügedən həftə ərzində coğrafiya fənni üzrə tərəfdaş universitetin tələbələri üçün seminar keçib, tərəfdaşların Bakı səfəri zamanı fakültədə görüləcək işlərin müzakirəsində iştirak edib.



Səfər çərçivəsində müxtəlif universitetlərin beynəlxalq ofislərinin nümayəndələri ilə görüşülüb, mümkün əməkdaşlıq imkanları müzakirə edilib.

Nümayəndə heyəti həmçinin "Erasmus +" mübadilə proqramı ilə cari semestrdə təhsillərini Kopenhagen Universitet Kollecində davam etdirən ADPU tələbələri ilə də görüş keçirib, onların təhsili ilə maraqlanıblar.

## "DAVAM" GƏNCLƏR HƏRƏKATI REKTOR CƏFƏR CƏFƏROVA TƏŞƏKKÜR EDİB



Aprelin 11-də Azərbaycan Gənclər Fondunun dəstəyi, "Davam" Gənclər Hərəkatının təşkilatçılığı ilə "Davamçı Gənclərin Birinci Forumu"nun açılış mərasimi baş tutub. Tədbirdə dövlət rəsmiləri, millət vəkilləri, təhsil və ictimai sektorun nümayəndələri iştirak ediblər.

Forumda Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru professor Cəfər Cəfərov gənclər hərəkatına göstərdiyi dəstəyə görə təşəkkür plaketi ilə təltif olunub. Təltifi rektorun köməkçisi Riyad Rüstəmli qəbul edib.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

## STRUKTURLARIMIZIN FƏALİYYƏTİ

### İNZİBATİ-TƏSƏRRÜFAT ŞÖBƏSİ

Pedaqoji Universitetdə inzibati-təsərrüfat şöbəsi 1930-cu ildən fəaliyyət göstərir. Hazırda şöbənin müdiri Səməd Abdullayev, müdir müavini Çinar Qaybalıyev, briqadiri isə Zabil Mikayılovdur.

Şöbədə Eynur Mütəllimli (əməyin mühafizəsi və təhlükəsizlik texnikası üzrə mütəxəssis), İkram Aslanov (baş mütəxəssis), Fikrət Qurbanov (mütəxəssis), Nüşabə Cəmşidova (mütəxəssis), Naibə Nuraliyeva (mütəxəssis), Sərənə Hüseynova (anbar müdiri), Rəfiqə Quliyeva (anbardar), Məhəbbət Həsənova (operator) və 153 nəfərlik texniki heyət fəaliyyət göstərir.

Şöbə ADPU-nun korpuslarında ("Səbail" (komendant Vaqif Allahverdiyev), "Gənclik" (komendant Gündüz Rüstəmov), "Nəsimi" (komendant Elgiz Məmmədov), "Təbriz" (komendant Əli Hacıyev)) təsərrüfat xidmətini həyata keçirir, liftlərin, işıqlandırma sisteminin, ventilyasiyanın (laboratoriyalarda) saz vəziyyətdə olmasını, əməkdaşların səmərəli işləməsi üçün zəruri şəraitin yaradılmasını təmin edir.

Korpuslar üzrə tədris binalarında aparılan təmir işlərinin keyfiyyətlə icra olunmasına, bütün otaqların normal işıqlandırma, istilik sistemləri, sanitar qovşaqlarının santexnika infrastrukturu ilə təmin edilməsinə, struktur bölmələrinin iş otaqlarının zəruri inventar və mebellə təchiz edilməsinə, onların mühafizəsinə və vaxtında təmir olunmasına nəzarət edir. Xidməti işlər üzrə müqavilələrin bağlanılmasına, dəftərxana ləvazimatlarının, təsərrüfat materiallarının, avadanlığın, inventarların alınması və saxlanılmasına, sahələrin abadlığına, yaşıllaşdırılmasına, təmizlənməsinə, inventarizasiyanın aparılmasına rəhbərlik edir, yanğından mühafizə tədbirlərini yerinə yetirir, yanğından müdafiə avadanlıqlarının işlək vəziyyətdə saxlanılmasını təmin edir. Universitetin təsərrüfat, mədəni-məişət işlərinə bilavasitə rəhbərlik edir. Pedaqoji Universitetin auditoriyalarında, yataqxana və yeməkxanalarında sanitar-gigiyenik vəziyyətə nəzarət edir.

Pedaqoji Universitetin Bakı şəhərinin müxtəlif rayonlarında yerləşən 4 tədris korpusu hər birinin təsərrüfat fəaliyyətini tənzimləyən komendantı vardır. Universitetin Bakı şəhərinin müxtəlif ərazilərində yerləşən 5 yataqxanasında 626 məcburi köçkün ailəsi (2315 nəfər) məskunlaşıb. Bu da əksəriyyəti regionlardan olan tələbələrin sosiallaşmasına, keyfiyyətli təhsil almasına, tələbə və müəllimlərin mobilliyinə, xarici ölkə tələbələrinin ADPU-ya cəlb edilməsinə ciddi təsir edir.



Pedaqoji Universitet böyük infrastruktura malikdir. Binaların əksəriyyəti köhnə olduğundan, mütəmadi olaraq təmirə ehtiyac yaranır. Son illərdə "Səbail" korpusunun 3-cü mərtəbəsində əsaslı təmir işləri görülmüşdür. Bütün istilik xətləri, elektrik təchizatı yenilənmiş, binanın dam hissəsində 800 kv/m-dək sahə, 26 auditoriya, 16 iş otağı əsaslı təmir edilmişdir. Təmir edilən auditoriyaların hamısı yeni parta, lövhə və digər avadanlıqlarla təchiz olunmuşdur. 14 mərtəbəli tədris binasının fasad üzlüyü yanğına davamlı, kompozit keramik materialla üzlənmiş, bütün qapı və pəncərələr daha keyfiyyətlisi ilə əvəz edilmişdir. Binanın üzlüyünün dəyişdirilməsi Azərbaycan Respublikasının Birinci vitse-prezidenti Mehriban xanım Əliyevanın tapşırığı ilə Heydər Əliyev Fondu tərəfindən həyata keçirilmişdir. ADPU-nun çoxminli kollektivi bu faktı ölkə rəhbərliyinin təhsilə, pedaqoji və elmi-pedaqoji kadr hazırlığına diqqət və qayğısının təzahürü kimi dəyərləndirir.

### İNSAN RESURSLARI ŞÖBƏSİ




Şöbənin fəaliyyətinin əsas məqsədi Pedaqoji Universiteti vəzifəyə uyğun peşəkar kadrlarla təmin etmək, universitetdə komanda ruhunu mühafizə etmək, maddi-mənəvi və sosial tələbatların ödənilməsi yolu ilə əməkdaşların motivasiyasının yaxşılaşdırılmasına, onların universitetə bağlılığına nail olmaqdır.

Şöbənin əsas funksiyası:

1) universitetin strateji inkişaf planına uyğun olaraq insan resurslarını planlaşdırmaq;
2) universitetə kadrların cəlb edilməsi, seçilməsi, işə qəbulu və işdən azad edilməsi ilə bağlı əməliyyatları həyata keçirmək;
3) əməkdaşların xidməti fəaliyyətlərini qiymətləndirmək və onların motivasiyasını həyata keçirmək;
4) əməkdaşların treninq və tədris kurslarında iştirakını təmin etmək;
5) əməyin stimullaşdırılması üçün təkliflər hazırlamaq;
6) müəyyən edilən meyarlar əsasında işçilər haqqında məlumat bazasını formalaşdırmaq;
7) insan resursları üzrə sənədləşmə və kadr-uçot işlərini (o cümlədən elektron) aparmaqdan ibarətdir.

Şöbə qanunvericilikdə nəzərdə tutulmuş digər funksiyaları da həyata keçirir. Müəyyən olunmuş müddət bitdikdən sonra professor-müəllimlərin, tədris köməkçi və texniki heyətin sənədlərinin arxivə təhvil verilməsinə nəzarət edir. İşçilərin əmək fəaliyyətinə dair arayışların, pensiya sığortasına dair müvafiq sənədlərin hazırlanmasını təmin edir. İnsan resursları şöbəsinə 2017-ci ildən Qumral Qədimova rəhbərlik edir. Şöbədə bölmə müdiri Rəna Qaralova, baş mütəxəssis Kifayət Qurbanova, mütəxəssislər İlahə Nağıyeva, Aysel İbrahimova, Rəvanə Rəsulova, Səkinə Abdurəhmanova, Zeynəb Həsənova, nəzarətçilər Sevda Ağamirzəyeva, Ayşən Bayramova, Səidə Səlimova, operator Nigar Süleymanova və statist Aida Əliyeva fəaliyyət göstərirlər.

### BAŞSAĞLIĞI



Təəssüf hissi ilə bildiririk ki, Azərbaycan Dövlət Pedaqoji Universitetinin Magistratura və doktorantura şöbəsinin Davamlı təhsil və innovasiyalar bölməsində təkrar ali təhsil alan tələbə **Yusubova Sevda Nurəddin qızı** ağır xəstəlik nəticəsində dünyasını dəyişmişdir. ADPU-nun rəhbərliyi, elmi-pedaqoji və tələbə heyəti adından mərhum tələbəmizin ailəsinə və yaxınlarına dərin hüznlə baş sağlığı diləyirik. Allah Rəhmət Eləsin!



Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 1143

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.